# 23 HƏDİS

**(ƏN GÖZƏL NÜMUNƏ PEYĞƏMBƏRİMİZ MUHƏMMƏD)**
**– sallallahu aleyhi və alihi və səlləm –**

**Bu Kitab, Azərbaycan Respublikası Dini Qurumlarla İş Üzrə Dövlət Komitəsinin 10 İyun 2008-ci İl Tarixli İcazəsi Əsasında Çap Edilmişdir №DK-48/H**

**MÜƏLLİF: K.HÜSEYN**
**KİTABIN BÜTÜN HAQLARI QORUNUR**

**RƏHİMLİ VƏ MƏRHƏMƏTLİ OLAN ALLAHIN ADI İLƏ**
***«Ey Rəbbimiz! Bizi doğru yola yönəltdikdən sonra ürəklərimizə şəkk-şübhə*** *(azğınlıq, əyrilik)* ***salma! Bizə Öz tərəfindən bir mərhəmət bəxş et, çünki Sən, doğurdan da, bəxşiş verənsən!»*** *(Ali İmran 8).*
***«Ey Rəbbimiz! Unutduqda və ya yanıldıqda bizi cəzalandırma! Ey Rəbbimiz! Bizdən əvvəlkiləri yüklədiyin kimi, bizi ağır yükləmə! Ey Rəbbimiz! Gücümüz çatmayan şeyi bizə yükləyib daşıtdırma! Bizi əfv edib bağışla, bizə rəhm et! Sən bizim ixtiyar sahibimizsən. Kafirlərə qələbə çalmaqda bizə kömək et!»*** *(əl-Bəqərə 286).*
Allahım! Bütün əməllərimin saleh əməl olmasını və bunları heç kimsə üçün deyil, sadəcə sənin rizan üçün olmasını diləyirəm.
Allahım! Bu kitabı toplayan üçün, oxuyan üçün, dinləyən üçün və yayan üçün xeyirli et! Amin!

# ÖN SÖZ

***XUTBƏTUL-HACƏ***

Həmd ancaq Allahadır, ona həmd edir, ondan yardım və məğfirət diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Allaha sığınırıq. Allah kimi hidayətə yönəltmişsə, onu heç kəs azdıra bilməz, kimi də azdırmışsa, heç kəs onu hidayətə yönəldə bilməz. Mən şəhadət edirəm ki, Allahdan başqa ilah yoxdur. O, təkdir, şəriki də yoxdur və şəhadət edirəm ki, Məhəmməd onun qulu və elçisidir.

***«Ey iman gətirənlər! Allahdan lazımınca qorxun. Yalnız müsəlman olduğunuz halda ölün».*** *(Ali-İmran 102).*

***«Ey insanlar! Sizi tək bir şəxsdən*** *(Adəmdən)* ***xəlq edən, ondan zövcəsini*** *(Həvvanı)* ***yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun****. (Adı ilə)* ***Bir-birinizdən*** *(cürbəcür şeylər)* ***istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən qorxun. Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir».*** *(ən-Nisa 1).*

***«Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin!*** *(Əgər belə etsəniz)* ***Allah əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə*** *(Cənnətə)* ***nail olar».*** *(əl-Əhzab 70-71)*[1].

Şübhəsiz ki, sözlərin ən doğrusu Allahın kəlamı, yolların ən xeyirlisi Muhəmməd - *sallallahu aleyhi və səlləm* - in yoludur. Sonradan uydurulub dinə salınan hər bir əməl (iş) bir bidətdir, hər bir bidət isə zəlalətdir (sapıqlıqdır), hər bir zəlalət isə oddadır[2].

***«Ey Rəbbim! köksümü açıb genişlət, işimi yüngülləşdir, dilimdəki düyünü aç ki, sözümü yaxşı anlasınlar».*** *(Ta ha 25–28).*

Möhtərəm müsəlman qardaş və bacılarım! İlk öncə hamınızı Allahın salamı ilə salamlayıram. Allahın kitabına və Rəsulu Muhəmməd - *səllallahu aleyhi və səlləm* – in sünnəsinə (yoluna) uyaraq öz risaləmi «***Bismilləh***» ilə başlayıram. Çünkü Allah Rəsulu - *sallallahu aleyhi və səlləm* - də öz məktublarını «***Bismilləh***» ilə başlamış və buyurmuşdu: «Hər mühüm bir işə «***Bismilləh***» ilə başlanılmazsa, o işin sonu kəsikdir»[3].

İlk öncə bu kitabın yazılma səbəblərindən damışmaq istəyirəm. Niyə görə məhz «23 Hədis» adı ilə bu kitabı adlandırmaq qərarına gəldim. Çünki Peyğəmbərimiz Muhəmməd - *sallallahu aleyhi və səlləm* – in iyirmi üç illik gözəl dəvəti zamanı rəvayət etmiş olduğu böyük, məzmun və həcimcə geniş, fayda və ibrətlərlə dolu hədisləri bu kitabda toplamaq qərarına gəldim. Həmçinin də Peyğəmbərimiz Muhəmməd - *sallallahu aleyhi və səlləm* – in iyirmi üç illik Peyğəmbərlik həyatında baş vermiş mühüm hadisələri bu kitabda toplamağa çalışdım. Çünkü bu kitabda olan hədislərin hər biri mənim qəlbimdə geniş sevgiyə, məhəbbətə səbəb olmuş və mənim qəlbimdə geniş bir yer tutmuşlar. Ümüdvaram ki, bu sizin üçün də belə olacaqdır.

Müsəlman qardaş və bacılarım! Buna görə də ilk öncə özümə, sonra da sizə bu kitabı oxumaqdan əlavə əzbərləyib yadda saxlamağı və hər bir elm məclislərində, xütbələrdə, dəvətlərdə bu ibrətamiz hədisləri yaşatmağı tövsiyə edirəm. Bu haqda Peyğəmbərimiz Muhəmməd - *səllallahu aleyhi və səlləm* – buyurur: «Kim İslamda gözəl bir sünnə ortaya qoyarsa, həmin adama həm onun mükafatı, həm də ondan sonra onunla əməl edənlərin mükafatı verilər və onlardan heç birinin mükafatdan heç bir şey də azaldılmaz. Kim isə İslamda pis bir sünnə ortaya qoyarsa, həmin adama həm onun günahı, həm də ondan sonra onunla əməl edənlərin günahı verilər və onlardan heç birinin günahından heç bir şey də azaldılmaz»[4].

Bu baxımdan da mən bu kitabı yazdım. Bu kitabı yazmaq, toplamaq üçün Quran Kərimdən sonra ən mötəbər kitablar sayılan Səhih Buxari və Səhih Müslimə müraciət etdim və Allahın izni ilə əlimizdəki bu kitabın toplanmasına nail oldum. İlk növbədə Allahdan bu çalışmamın dolğun, düzgün şəkildə yazıb başa çatdırılmasını diləyirəm. Allahdan əməlimi onun üçün ixlaslı olmasını, məndən qəbul edib onunla müsəlmanları faydalandırmasını diləyirəm. Əgər haradasa xəta etmişəmsə bu məndəndir. Mənim

---

[1] ***XUTBƏTUL-HACƏ -*** adı ilə məşhur olan bu duanı, cümə və s. xütbələrdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - oxumuşdu. Səhabələrinə də bunu əmr etmiş və özü də onları öyətmişdir. Hədisin ilk hissəini bizə: – Əhməd 1/392-393,432, Əbu Davud 2188, Tirmizi 1105, Nəsəi 3/104-105, 6/69 və «Əməlul Yəum vəl Leyl» 488, İbn Məcə 1892, Darimi 2202, Tayalisi «əl-Musnəd» 1557, Abdurrazzaq «əl-Musənnəf» 10449, Bəzzar «əl-Musnəd» - Kəşful Əstar 1/314, Əbu Yəla «əl-Musnəd» 5233-5234,5257, Tahavi «Şərhul Müşkilil Asar» 1-3, Təbərani «Məcmuul Kəbir» 10/10079-10080, Həkim «əl-Mustədrək» 2744, Beyhəqi «Sünnənul Kubra» 3/214-215, Bəğavi «Şərhus Sunnə» 2268 İbn Məsud - *radıyallahu anhu* – yolu ilə, Müslim «Şərhu Nəvəvi» 6/156,158, Əhməd 1/302,350, Nəsəi 6/89-90, İbn Məcə 1893 və Tahavi «Şərhul Müşkilil Asar» 4 İbn Abbas - *radıyallahu anhu* – yolu ilə, Tahavi «Şərhul Müşkilil Asar» 5, Beyhəqi «Sünnənul Kubra» 3/215 Nubeyt b. Şərit - *radıyallahu anhu* – yolu ilə, Əbu Yəla «əl-Musnəd» 7221, Nəsəi «Sünnənul kubra» bax: «Tuhfetul Əşraf» 6/472 № 9148 Əbu Musa əl-Əşari - *radıyallahu anhu* – yolu ilə.

[2] Hədisin ikinci hissəsini – Müslim «Şərhu Nəvəvi» 6/153-156, Əhməd 3/319,371, Nəsəi 3/188-189, Beyhəqi «Sünnənul Kubra» 3/214 Cabir b. Abdullah - *radıyallahu anhu* – yolu ilə. Bu ləfz Nəsainin ləfzidir. Hədisi Əhməd 3/371 və Müslim: «Sözlərin ən doğrusu» ləfzi yerinə: «Sözlərin ən xeyirlisi» ləfziylə rəvayət edilmişdir. İmam Əhmədin digər rəvayətlərində isə 3/319: «Sözlərin ən gözəli» şəkilindədir. Müslim: «Sonradan uydurulub dinə salınan hər bir əməl (iş) bidətdir» ləfzi yerinə: «Hər bir bidət bir zəlalətdir (sapıqlıqdır)» ləfziylə ravayət etmişdir. Hədisin sonunda olan: «Hər bir zəlalət isə oddadır» ləfzini zikr etməmişdir. Bu beş səhabədən başqa hədsi: Aişə - *radıyallahu anhə* –, Səhl b. Sad - *radıyallahu anhu* – mərfu olaraq. Hədis səhihdir. Muhəddis Muhəmməd Nəsrəddin əl-Albani – *rahmətullahi aleyhi* – hədisin bütün rəvayətlərini bir yerə toplayaraq «Xutbətul Həcə» isimli bir kitab yazmışdır. İstəyənlər bu kitaba baxa bilərlər. Ayrıca bax: əl-Albani «Muxtəsər Səhih Müslim» 409, «Mişkətul Məsabih» 3149,5860.

[3] Əbu Davud.

[4] Müslim 1017.

acizliyimdən və çarəsizliyimdəndir. Şeytandan və carəsizlikdən Allaha sığınıram. Burada düzəldilməsi mühüm olan yerləri tapdıqdan sonra mənə öyüt-nəsihət verəndən, xətalarımı və səflərimi mənə bəyan edəndən Allah razı olsun. Allah onu xeyirlə mükafatlandırsın. Mən ona əvvəlcədən öz təşəkkürümü bildirirəm.

Ayrıca bu kitabı yazmaqda mənə kömək edən, bu kitab da zəhməti olan, öyüt vermək və ya dua etmək məqsədilə mənə yardım edən hər bir kəsə təşəkkür edirəm. Allah onları da xeyirlə mükafatlandırsın.

Güvəndiyim Allahdır, işlərimi ona həvalə edirəm və ona arxalanıram. Həmd və nemət yalnız onadır. Müvəffəqiyyət bəxş edən və xətalardan qoruyan da odur. ***«Məni yaradan və məni doğru yola yönəldən Odur! Məni yedirdən də, içirdən də Odur! Xəstələndiyim zaman mənə yalnız O şəfa verir. Məni öldürəcək, sonra dirildəcək də Odur və Qiyamət günü xətamı bağışlayacağına ümid etdiyim də Odur! Ey Rəbbim! Mənə hikmət bəxş et və məni salehlərə qovuşdur! Sonra gələnlər arasında mənə yaxşı ad qismət et! Məni Nəim Cənnətlərinin varislərindən et».*** *(əş-Şuəra 78-85).*

Allahın salat və salamı onun Peyğəmbəri Muhəmməd - *sallallahu aleyhi və səlləm* - ə, onun ailə üzvlərinə, səhabələrinə və Qiyamətə qədər onun yolu ilə gedən əməlisaleh möminlərin üzərinə olsun.

**BİTİRDİM: HİCRİ 1425-ci il 7 CƏMƏDİYƏL ƏVVƏL.**
**MİLADI 2004-cı il 25 IYUN.**
**HƏMD OLSUN ALƏMLƏRİN RƏBBİ OLAN ALLAHA! (YUNUS 10).**

# BİRİNCİ HƏDİS
## (ƏMƏLLƏR NİYYƏTLƏRƏ BAĞLIDIR)

***«Bil ki, xalis din yalnız Allaha məxsusdur».*** *(əz-Zumər 3).* ***«Halbuki, onlara əmr edilmişdir ki, Allaha dini yalnız ona məxsus edərək, digər bütün batil dinlərdən İslama dönərək ibadət etsinlər. Namaz qılıb, zəkat versinlər. Doğru-düzgün din budur».*** *(əl-Bəyyinə 5).* ***De ki: «Mənim namazım da, ibadətim də, həyatım və ölümüm də aləmlərin Rəbbi Allah üçündür! Onun heç bir şəriki yoxdur. Mənə belə buyrulmuşdur və mən ilk müsəlmanam!»*** *(əl-Ənam 162-163).*

Huzeyfə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «(Keçmiş ümmətlərdə) Heç bir həsənə (xeyir iş) etməmiş bir kimsə ölümün gəlib çatdığını və yaşamaq ümüdünü itirdikdə ailəsini yanına çağıraraq onlara vəsiyyət edib dedi: «Mən öldükdən sonra odun toplayıb tonqal qalayın. Sonra məni (tonqalın) içinə atın. Atəş mənim vücudumu (cəsədimi), sümüklərimlə birlikdə yandırıb qurtardıqdan sonra (qalan) sümüklərimi üyüdüb toz halına salın. Sonra küləkli bir havanı gözləyib (üyüdülmüş cəsədimi) küləyə tutub dənizin üzərinə sovurun. (Başqa rəvayətdə: «Allaha and olsun! Əgər Rəbbim məni ələ keçirməyə qadir olarsa aləmlərdə heç bir kimsəyə tətbiq etmədiyi bir əzabla məni cəzalandıracaqdır» dedi). Bu kimsə öldükdən sonra (yaxınları) onun dediyi kimi etdilər. (Başqa rəvayətdə: «(Qiyamət günü) Allah yerə də, dənizə də əmr edər! Aldığınız zərrələri geri qaytarın!»). Sonra Allah onu zərrələrinə kimi toplayaraq: «Səni bu işə sövq edən nə idi? (Nəyə belə etdin?»)) deyə buyurdu. O, kimsə: «Sənin qorxun! Ya Rəbbim!» deyə cavab verdi. Allah da o, kimsəni bağışladı[5].

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən Qiyamət günü əleyhinə hökm olunan ilk kimsə Allah yolunda (vuruşaraq) şəhid olmuş bir kimsədir. O, Allahın hüzuruna gətirilir. Allah da ona vermiş olduğu nemətləri xatırladır. O, da onları etiraf etdikdən sonra (Allah): «Bu verdiyim nemətlərin əvəzində sən nə əməl etdin?» deyə buyurur. (Şəhid): «Mən Sənin yolunda vuruşdum və şəhid oldum!» deyə cavab verir. (Allah): «Sən yalan söylədin! Çünki sənə cəsursan desinlər deyə vuruşdun və (onlar da) sənin haqqında belə dedilər!» deyə buyurur. Sonra əmr verilir və o, kimsə üzü üstə sürüklənərək Cəhənnəmə atılır».

(İlk sorğuya çəkilənlərdən biri də) Elm öyrənmiş, öyrəndiyini başqalarına öyrətmiş və Quran oxuyan bir kimsədir ki, Allahın hüzuruna gətrilir. Allah da ona vermiş olduğu nemətləri xatırladır. O, da onları etiraf etdikdən sonra (Allah): «Bu verdiyim nemətlərin əvəzində sən nə əməl etdin?» deyə buyurar. (Alim): «Elm öyrəndim, öyrəndiyim (elmi) başqalarına öyrətdim və Sənin rizan üçün Quran oxudum!» deyə cavab verir. (Allah): «Sən yalan söylədin! Çünki sənə (sən) alimsən desinlər deyə elm öyrəndin, gözəl qiraətçisən desinlər deyə Quran oxudun və sənin haqqında da bunlar söylənildi!» deyə buyurar. Sonra əmr verilir və o, kimsə üzü üstə sürüklənərək Cəhənnəmə atılır».

(Sorğuya çəkilənlərdən biri də) Allahın var-dövlət verdiyi və hər cür sərvət ehsan buyurduğu bir kimsədir ki, Allahın hüzuruna gətrilir. Allah ona da vermiş olduğu nemətləri xatırladır. O, da onları etiraf etdikdən sonra (Allah): «Bu verdiyim nemətlərin əvəzində sən nə əməl etdin?» deyə buyurur. (Varlı): «Xərclənilməsini sevdiyin elə bir yol yoxdur ki, mən o, yolların hamısında Sənin rizan üçün (malımı) sərf etməyim!» deyə cavab verir. (Allah): «Sən yalan söylədin! Çünki sənə (sən) mərhəmətli-sən desinlər deyə sərf etdin və sənin haqqında da bunlar söylənildi!» deyə buyurar. Sonra əmr verilir və o, kimsə üzü üstə sürüklənərək Cəhənnəmə atılır»[6].

# İKİNCİ HƏDİS
## (İMAN, İSLAM, EHSAN)

***«Yaxşı əməl sahibi olub özünü Allaha təslim*** *(İslam)* ***edən, İbrahimin hənif***[7] ***millətinə*** *(dininə)* ***tabe olan şəxsdən din etibarilə daha gözəl kim ola bilər».*** *(ən-Nisa 125).* ***«Yaxşı əməl heç də üzünü günçıxana və günbatana tərəf çevirməkdən ibarət deyildir. Yaxşı əməl sahibi əslində Allaha, Axirət gününə, Mələklərə, Kitaba*** *(Allahın nazil etdiyi bütün ilahi kitablara)* ***və Peyğəmbərlərə inanandır».*** *(əl-Bəqərə 177).* ***«Şübhəsiz ki, biz hər bir şeyi müəyyən ölçüdə*** *(qədər)* ***ilə yaratdıq».*** *(əl-Qəmər 49).* ***«O, Allah ki, səni namaza duranda da görür, səcdə edənlər içində olanda da. Həqiqətən*** *(hər şeyi)* ***eşidən və bilən Odur!».*** *(əş-Şuəra 218-219).* ***«Həqiqətən Allah Ondan qorxub pis əməllərdən çəkinənlər və yaxşı işlər görənlərlədir».*** *(ən-Nəhl 128).*

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - insanların əhatəsində olduğu vaxt bir nəfər ona yaxınlaşıb: «Ya Rəsulallah! İman nədir?» deyə soruşdu.

---

[5] Buxari 3452, Müslim 2756-2757.

[6] Müslim 1905.

[7] ***HƏNİF*** – haqq üzərində düz yeriyən və ona uyan kimsə deməkdir. Bütün dinlərdən üz çevirərək haqqa yönələn kimsədir. «Lisanul-Ərab» 9/157, «İbn Kəsir təfsir» 1/186,187, «Muhtarus-Sihah» s. 159. Digər bir tərif – şirkdən uzaq olan, Allaha ixlas üzərində bina edilmiş dinin adıdır. «Uç əsas» Seyx Useyminin şərhi ilə.

(Peyğəmbər): «(İman) Allaha, Mələklərinə, Kitablarına, Onunla (Allahla) görüşməyə, Peyğəmbərlərinə və Axirət günü dirilməyə iman etməkdir» deyə buyurdu. (Adam): «Ya Rəsulallah! İslam nədir?» deyə soruşdu. (Peyğəmbər): «(İslam) Allaha ibadət etmək və Ona heç bir şeyi şərik qoşmamaq, namaz qılmaq, fərz olan zəkatı vermək və Ramazan ayında oruc tutmaqdır» deyə buyurdu. (Adam): «Ya Rəsulallah! Ehsan nədir?» deyə soruşdu. (Peyğəmbər): «(Ehsan) Allaha Onu görür kimi ibadət etməkdir. Lakin sən Onu görməsən də, (şübhəsiz) ki, O səni görür!» deyə buyurdu. (Adam): «Ya Rəsulallah! «Mənə Qiyamət günü haqqında xəbər ver!» deyə soruşdu. (Peyğəmbər): «Bu məsələdə soruşulan soruşandan cox bilmir (elimli deyildir). Lakin mən sənə onun əlamətləri haqqında xəbər verə bilərəm. Qul qadın (cariyənin) öz ağasını doğması, ayaq-yalın, cılpaq, (bir vaxtlar mal-qara otarması ilə məşğul olan) cobanların hündür binalar tikməkdə bir-biriləri ilə yarışmaları. (Qiyamət günü) qeybdən olan beş şeyin içərisindədir ki, onları Allahdan başqa heç kəs bilməz». Sonra Peyğəmbər: ***«Həqiqətən qiyamətin qopacağı vaxtı ancaq Allah bilir. Yağışı*** *(istədiyi vaxt)* ***göydən O yağdırır, bətnlərdə olanı*** *(doğulacaq uşağın oğlan, yaxud qız, xəstə və ya sağlam, xoşbəxt və ya bədbəxt, yaxşı və ya pis əməl sahibi olacağını)* ***O bilir, heç kəs səhər nə edəcəyini*** *(savab, yaxud günah qazanacağını),* ***heç kəs harada öləcəyini bilməz. Allah isə, şübhəsiz ki,*** *(hər şeyi)* ***biləndir və*** *(hər şeydən)* ***xəbərdardır!».*** *(Loğman 34)* ayəsini oxudu.

(Əbu Hureyrə) dedi ki: «Sonra o, şəxs çıxıb getdi». Onun ardından Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - (səhabələrinə): «Onu geri qaytarın!» deyə buyurdu. (Səhabələr) Onu geri qaytarmaq üçün axtarmağa başladılar. Lakin heç kəsi tapa bilmədilər. Bundan sonra Peyğəmbər: «Bu Cəbrail – *əleyhissəllam* – idi. İnsanlara dinlərini öyrətmək üçün gəlmişdi!» deyə buyurdu. (Başqa rəvayətdə: «Bu Cəbrail – *əleyhissəllam* – idi. Öyrənməyinizi istədi. Çünki siz soruşmamışdınız!» deyə buyurdu). Başqa rəvayətdə: Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Rasulullah – *sallallahu aleyhi və səlləm* - in hüzurunda oturmuşduq. Bu vaxt paltarı düm ağ, saçları olduqca qara, üzərində səfər əlaməti görünməyən və aramızda hec kimsənin tanımadığı bir nəfər içəri girib, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - in yanında oturdu. İki dizini onun dizlərinə söykəyib, əllərini (öz) dizlərinin üstünə qoyaraq: «Ey Məhəmməd! Mənə İslam haqqında xəbər ver!» deyə soruşdu. (Peyğəmbər): «(İslam) Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına, Muhəmmədın Allahın elçisi olduğuna şəhadət etmək, namaz qılmaq, zəkat vermək, Ramazanda oruc tutmaq, imkan olduqda Kəbəni həcc etməkdir» deyə buyurdu. (Adam): «Doğru söylədin!» deyə cavab verdi. (Ömər) dedi ki, adama heyrət etdik. Həm ona sual verir, həm də onun söylədiklərini təsdiq edirdi. (Adam): «Mənə İman haqqında xəbər ver!» deyə soruşdu. (Peyğəmbər): «(İman) Allaha, Mələklərinə, Kitablarına, Peyğəmbərlərinə, Axirət gününə və Qədərin Xeyir və Şərridə Allahdan olmasına inanmaqdır» deyə buyurdu… (Ömər) dedi ki, sonra o, adam durub getdi. Bir müddətdən sonra (Peyğəmbər) mənə buyurdu: «Ey Ömər! O, sual verənin kim olduğunu bilirsənmi?» (Ömər): «Allah və Rəsulu daha gözəl bilir!» deyə cavab verdi. (Peyğəmbər): «O, Cəbrail – *əleyhissəllam* - idi. Sizə dininizi öyrətməyə gəlmişdi!» deyə buyurdu[8].

## ÜÇÜNCÜ HƏDİS
### (HƏR BİR ŞEY ƏZƏLDƏN TƏQDİR EDİLMİŞ QƏDƏRLƏDİR)

***«Allahın izni olmadıqca*** *(heç kəsə)* ***heç bir müsibət üz verməz. Kim Allaha iman gətirsə, Allah onun qəlbini haqqa doğru yönəldər və o, dünyada baş verən hər şeyin Allahın əzəli hökmü və izni ilə olduğunu bilər. Allah hər şeyi biləndir».*** *(ət-Təğabun 11).* ***«O, Allah ki, göylərin və yerin hökmü Onundur. O*** *(özünə)* ***heç bir övlad götürməmişdir. Mülkündə heç bir şəriki yoxdur. O, hər şeyi yaratmış və onu*** *(onun üçün nə olacağını)* ***əvvəlcədən müəyyən etmişdir».*** *(əl-Furqan 2).*

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Adəm ilə Musa – *əleyhimussəlam* - Rəbbləri qatında bir-birləri ilə mücadələ etdilər. Nəticədə Adəm, Musaya hüccətlə qələbə çaldı. Musa: «Sən, Allahın əli ilə yaratdığı, öz ruhundan üfürdüyü, mələklərini sənə səcdə etdirdiyi, Cənnətdə yerləşdir-diyi, sonra da etdiyin xətadan ötrü insanları yer üzünə endirən Adəm deyilsənmi?» deyə soruşdu. Adəm: «Sən, Allahın Rəsulu və kəlimi olaraq seçdiyi, içində hər şeyin bəyanı olan Lövhələri (Tövratı) verdiyi və səninlə (vasitəçisiz) danışmaq üçün Allahın özünə yaxınlaşdırdığı Musa deyilsənmi? Səncə Mənim yaradılışımdan neçə il öncə Allahın Tövratı yazdığını bilirsən?» deyə soruşdu. Musa: «Qırx il əvvəl» deyə cavab verdi. Adəm: «Tövratın içində: ***«Və Adəm Rəbbinə asi oldu …».*** (Ta ha 121) ayəsini oxudunmu?» deyə soruşdu. Musa: «Bəli, oxudum» deyə cavab verdi. Adəm: «Elə isə Allahın məni yaratmamışdan qırx il öncə üzərimə yazdığı və edəcəyim bir işdən ötrü məni qınayırsan?» dedi. Peyğəmbər: «Beləcə Adəm, Musanı hüccətlə məğlub etdi!» deyə buyurdu[9].

[8] Buxari 50, Müslim 8-9-10.
[9] Müslim 2652.

# DÖRDÜNCÜ HƏDİS
## (İLK VƏHYİN BAŞLANMASI)

***«Yoxdan yaradan Rəbbinin adı ilə oxu! O, insanı laxtalanmış qandan yaratdı. Oxu! Sənin Rəbbin ən böyük Kərəm sahibidir! O, Rəbbin ki, qələmlə** (yazmağı) **öyrətdi. O, Rəbbin ki, insana bilmədiklərini öyrətdi».*** *(əl-Ələq 1-5).* ***«Ey** (libasına) **örtünüb bürünmüş Peyğəmbər! Qalx** (qövmünü Allahın əzabı ilə) **qorxut! Öz Rəbbini uca tut. Libasını təmizlə. Əzaba səbəb olacaq pis şeylərdən uzaqlaş.** (Etdiyin yaxşılığı) **çox bilib başa qalxma. Rabbinin rizasını qazanmaq üçün səbr et».*** *(əl-Muddəssir 1-7).*

Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə ilk vəhyin başlanğıcı yoxusunda doğru yuxu (***RUYAİ-SADİQA***) görməklə başlamışdır. Yuxusunda gördüyü hər bir yuxu səhər aydınlığı kimi açıq şəkildə həyata keçirdi. Bundan sonra qəlbinə tənha qalmaq sevgisi sevdirildi. Artıq Hira[10] mağarasına çəkilərək orada ailəsinin yanına qayıdana qədər bir neçə gün tək qalaraq təhənnəs[11] (yəni ibadət) edərdi. Bu məqsədlə bir neçə günlük azuqə götürüb mağaraya gedərdi. Azuqə qurtardıqda Xədicə[12] - *radıyallahu anhə* – nin yanına qayıdar, yenə eyni şəkildə (bir neçə günlük) azuqə götürərək təkrar geri qayıdardı. Onda olan bu hal Hira mağarasında Haqq (yəni vəhy) gəlincəyə qədər davam etdi. Nəhayət Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bir gün Hira mağarasında olduğu vaxt Haqq (yəni vəhy) gəldi. Ona mələk gələrək: «İqra! (Oxu!)» dedi. O, da: «Mən oxuya bilmirəm!» deyə cavab verdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu ki: «(Mən bu sözləri deyəcək) Mələk məni götürərək qucaqladı və taqətim kəsilincəyə qədər sıxdı. Sonra məni buraxaraq yenə də: «İqra! (Oxu!)» dedi. Mən də: «Mən oxuya bilmirəm!» dedim. Yenə məni götürüb qucaqlayaraq ikinci dəfə taqətim kəsilincəyə qədər sıxdı. Sonra məni buraxaraq yenə də: «İqra! (Oxu!)» dedi. Mən də: «Oxuya bilmirəm!» dedim. Nəhayət məni təkrak qucaqlayaraq üçüncü dəfə taqətim kəsilincəyə qədər sıxdı. Sonra məni buraxaraq bu ayələri oxudu: ***«Yoxdan yaradan Rəbbinin adı ilə oxu! O, insanı laxtalanmış qandan yaratdı. Oxu! Sənin Rəbbin ən böyük Kərəm sahibidir! O, Rəbbin ki, qələmlə** (yazmağı) **öyrətdi. O, Rəbbin ki, insana bilmədiklərini öyrətdi».*** *(əl-Ələq 1-5).*

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – vəhy olunan bu ayələrdən sonra qəlbində bir qorxu (titrəmə) olaraq evə Xədicə b. Xuveylid - *radıyallahu anhə* – nin yanına qayıtdı. Dərhal: «Məni örtüb bürüyün! Məni örtüb bürüyün!» deyə buyurdu. Onu örtdülər. Qorxu ondan gedənə qədər o, bu vəziyyətdə qaldı. (Qorxu ondan getdikdən sonra) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Xədicə - *radıyallahu anhə* – ə: «Ey Xədicə! Mənə nə olur?» deyə buyurdu və baş vermiş şeyləri ona xəbər verdi. Peyğəmbər: «Özüm-özümdən (nəfsimdən) qorxdum!» deyə buyurdu. Xədicə: «Yox, yox elə demə! Allaha and olsun ki, Allah səni heç vaxt utandırmaz (rüsvay etməz). Çünki sən qohumluq əlaqələrini möhkəmlən-dirir, daima sözün düzünü deyir (yalan danışmır), işini görməkdə aciz olanların yükünü yüngülləşdirir, kasıba əl tutur, müsafirə (qonağa) ehtiram göstərir, haqq yolunda baş verən hadisələr qarşısında (xalqa) kömək edirsən!» dedi.

Bundan sonra Xədicə - *radıyallahu anhə* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i götürüb əmisi oğlu Varaka b. Nofəl b. Əsədi b. AbdulUzzanın yanına aparır. O, cahiliyyə dövründə Xristianlığı qəbul etmiş bir kimsə idi. Ərəbcə (oxuyub) yazmağı bacarır, İncildən bəzi şeyləri Allahın dilədiyi qədər ərəbcəyə (tərcümə edərək) yazırdı. Varaka, gözlərinə korluq gəlmiş yaşlı (ixtiyar çağına çatmış) bir kimsə idi. Xədicə: «Ey əmi! Dinlə gör əmin oğlu nə danışır?» dedi. Varaka: «Ey qardaşım oğlu! Danış görək nələr görürsən?» dedi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – gördüklərini xəbər verdi. Varaka (qulaq asdıqdan) sonra ona: «Bu gördüyün Allah – *subhənəhu və təalə* – nin Musa – *əleyhissəlam* – a göndərdiyi Namusdur (yəni vəhyin sirrinin sahibi Cəbrail – *əleyhissəlam* – dır). Varaka: «Ah! Kaş ki, sənin dəvət günlərində cavan olardım! Qövmün səni qovalayacaqları zaman həyatda olardım!» dedi. Peyğəmbər: «Onlar məni qovalayacaqlarmı?» deyə buyurdu. Varaka: «Bəli, çünki sənin gətirdiyin şeyi (dini, şəriəti) gətirmiş olan hər kəs bu düşmənçiliyə məruz qalmışdır. Lakin sənin dəvət günlərinə çatsam sənə son dərəcə çox yardım edərəm!» deyə cavab verdi. Lakin Varaka bir müddətdən sonra dünyasını dəyişir, vəhy isə bir müddət kəsilir.

Cabir b. Abdullah - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «(Bir gün) Yol ilə gedərkən birdən-birə səmadan bir səs eşitdim. (Başqa rəvayətdə – Dərhal qabağıma, arxama, sağıma və soluma baxdım. Lakin heç kimsəni görmədim. Sonra yenə də nida olundum, bu dəfə də baxdım. Lakin heç kimsəni görmədim. (Bir müddətdən sonra yenə də nida olundum). Bu dəfə başımı yuxarı qaldırdım. Bir də baxdım ki, Hira mağarasında mənim yanıma gələn Mələk (Cəbrail) səma ilə yer arasında bir kürsü üzərində oturmuşdur. Mən çox qorxdum. Dərhal evə gəldim və: «Məni örtün! Məni örtün!» dedim. Məni bütüyüb örtdülər. Bundan sonra Allah bu ayələri mənə endirdi: ***«Ey** (libasına) **örtünüb bürünmüş Peyğəmbər! Qalx** (qövmünü Allahın əzabı ilə) **qorxut! Öz Rəbbini uca tut. Libasını təmizlə. Əzaba səbəb olacaq pis şeylərdən uzaqlaş.** (Etdiyin yaxşılığı) **çox bilib başa qalxma. Rabbinin rizasını***

---

[10] Məkkə yaxınlığında yerləşən dağın adıdır.

[11] ***TƏHƏNNƏS*** – ibadət etmək deməkdir. Mağaraya çəkilərək orada Həniflik edərdi. ***HƏNİF*** – İbrahim – *əleyhissəlam* – ın dininin adı idi. Hənifləri təqib edərək onların yolunu gedərdi.

[12] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in ilk zövcəsidir.

***qazanmaq üçün səbr et».*** *(əl-Muddəssir 1-7).* Bundan sonra vəhy arxa-arxaya heç kəsilmədən gəlməyə başladı.

Rəvayət edilir ki, İbn Abbas - *radıyallahu anhu* – Allah – *subhənəhu və təalə* – nin bu ayələrini: *«(Ya Peyğəmbər! Cəbrail sənə Quran oxuduğu zaman)* ***onu tələmtələsik əzbərləmək üçün dilini tərpətmə!*** *(Sən də onunla birlikdə Quranı təkrar etmə, yalnız dinlə!)»* *(əl-Qiyəmə 16)* təfsir edərkən deyərdi: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – vəhyin ilk başlanğıcında həmişə sıxıntı (qorxu) hiss edərdi. Bu da onun (Quranı tələm-tələsik əzbərləmək üçün Cəbrail ilə birlikdə) dodaqlarının tərpətməsinə səbəb olurdu». İbn Abbas - *radıyallahu anhu* – (öz tələbələrinə) deyərdi: «İndi məndə eynilə Peyğəmbərmiz – *sallallahu aleyhi və səlləm* – in dodaqlarını tərpətdiyi kimi tərpədəcəyəm!». İbn Abbas - *radıyallahu anhu* – deyir ki, Allah – *subhənəhu və təalə* – digər bir ayəni nazil etdi: *«(Ya Peyğəmbər! Cəbrail sənə Quran oxuduğu zaman)* ***onu tələmtələsik əzbərləmək üçün dilini tərpətmə!*** *(Sən də onunla birlikdə Quranı təkrar etmə, yalnız dinlə!).* ***Çünki onu sənin qəlbində cəm etmək*** *(dilində)* ***oxutmaq Bizə aiddir»*** *(əl-Qiyəmə 16-17).* İbn Abbas - *radıyallahu anhu* – deyir: «(Bu o, deməkdir ki) Ayələri sənin qəlbində elə bir şəkildə cəm etmək ki, sən onları oxuya biləsən»[13]. (O, ki qaldı bu ayələrə) Allah – *subhənəhu və təalə* – buyurur: ***«Biz onu*** *(Cəbrailin dili ilə)* ***oxutduğumuz zaman oxunmasını diqqətlə dinlə»*** *(əl-Qiyəmə 18).* İbn Abbas - *radıyallahu anhu* – deyir: «(Bu o, deməkdir ki) Ona (Cəbrailə) diqqətlə qulaq as!». Allah – *subhənəhu və təalə* – buyurur: ***«Sonra onu*** *(sənə)* ***izah etmək də Bizə aiddir!»*** *(əl-Qiyəmə 19).* İbn Abbas - *radıyallahu anhu* – deyir: «(Bu o, deməkdir ki) Ayələri sənin oxumağın üçün sənə izah etmək də bizə aiddir. Bundan sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Cəbrail – *əleyhissəlam* – a diqqətlə qulaq asıb onu dinləyər. O, getdikdən sonra isə onun dediklərini olduğu kimi təkrar edərdi»[14].

## BEŞİNCİ HƏDİS
### (PEYĞƏMBƏRİMİZ MUHƏMMƏD – *sallallahu aleyhi və səlləm* – in MERAC[15] SƏFƏRİ)

***«Biz onu yüksək məqama qaldırdıq».*** *(Məryəm 57).* ***«Bəzi ayələrmizi göstərmək üçün bəndəsini bir gecə*** *(Məkkədəki)* ***Məscidülhəramdan ətrafını mübarək etdiyimiz*** *(bərəkət verdiyimiz)* ***MəscidülƏqsaya aparan Allah pak və müqəddəsdir. O doğurdan da,*** *(hər şeyi)* ***eşidən və biləndir!»*** *(əl-İsra 1).*

Məlik b. Sasa - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kəbədə əl-Hicr deyə adlanan yerdə yatarkən biri gəlib[16] boğazımdan qarnımın alt tərəfinə qədər olan hissəni yardı. Sonra qızıldan bir qab gətirdi. Qəlbimi çıxardıb Zəm-Zəm suyu ilə yuduqdan sonra onu hikmət və iman ilə doldurdu. Sonra (qəlbimi) yerinə qaytardı. Bu da məni irəlidə gözləyən üçün bir hazırlıq idi. (Başqa rəvayətdə: Ənəs b. Məlik - *radıyallahu anhu* – deyir ki, Əbu Zərr - *radıyallahu anhu* – belə rəvayət etdi ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən Məkkədə olduğum vaxt evimin tavanı yarıldı. Cəbrail – *əleyhissəlam* – endi. Köksümü yararaq onu Zəm-Zəm suyu ilə yudu. Hikmət və iman ilə dolu qızıldan bir qab gətirdi. İçindəkiləri köksümün içinə boşaltdı. Sonra köksümü bağladı. Əlimdən tutaraq məni səmaya doğru qaldırdı!»). (Başqa rəvayətdə isə: Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – uşaqlarla oynayarkən Cəbrail – *əleyhissəlam* – onun yanına gəldi. Onu götürərək yerə yıxdı və sinəsini yardı. Qəlbini çıxardı. Qəlbindən bir qan laxtasını çıxardıqdan sonra: «Bu şeytanın səndən olan bir nəsibidir!» deyə ona göstərdi. Sonra qəlbini qızıldan bir qab içində Zəm-Zəm suyu ilə yudu. Daha sonra qəlbini yerinə qoydu. Onunla oynayan uşaqlar qaçaraq süd anasının yanına gəldilər və: «Məhəmməd öldürüldü!» dedilər. Onun yanına gəldilər. Rəngi soluq bir halda idi. Ənəs: «Mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sinəsində olan o, izi görmüşəm!» dedi).

Sonra qatırdan alçaq, eşşəkdən böyük olan Burak adı verilən ağ bir minik gətirildi. Bu minik addımını gözün son görmə hədinə qədər qoyardı. (Başqa rəvayətdə: «Cəbrail – *əleyhissəlam* – ilə birlikdə miniyə mindim. Beytul Məqdisə gəldim. Onu (miniyi məndən əvvəlki) Peyğəmbərlərin bağladıqları halqaya bağladım. Sonra məscidə girdim. Peyğəmbərlərə imam olaraq iki rükət namaz qıldım. (Bütün Peyğəmbər-lər də onun arxasında namaz qıldılar)». Sonra Cəbrail – *əleyhissəlam* – ilə birlikdə dünya səmasına yüksəldim. Birinci səmanın (qapılarına) yaxınlaşdıq. Cəbrail – *əleyhissəlam* – (qapıların) açılmasını istədi. Gözətçilər: «Kimdir O?» deyə soruşdular. «Cəbraildi!» dedi. Gözətçilər: «Yanında kim var?» deyə soruşdular. Cəbrail: «Muhəmməd!» deyə cavab verdi. Gözətçilər: «Ona risalət verildimi? (Yəni ona bura gəlsin deyə dəvət göndərildimi?)» deyə soruşdular. Cəbrail: «Bəli!» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi!» deyildi və onun üçün səma (qapısı) açıldı. Birinci səmada Adəm – *əleyhissəlam* – göründü. Cəbrail mənə: «Bu sənin baban

---

[13] Allah – *subhənəhu və təalə* – özü bütün Quranı sənin qəlbində cəm edəcəkdir və sənin üçün asant olsun deyə onun oxunuşunu da asantlaşdıracaqdır.
[14] Buxari 3-4-5, Müslim 160-161.
[15] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – **10** il Allahın əmrinə tabe olaraq tövhidə dəvət etdi. On ildən sonara göylərə yüksəldi. Merac – ***ARACƏ*** sözündən götürülüb. Yəni ***URUC*** - qalxmaq, yüksəlmək deməkdir. İsra – ***ƏSRA*** sözündən götrülüb. Bəzilərinin dediyinə görə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Merac səfərini yuxuda edib, digərlərinin dediyinə görə o – *sallallahu aleyhi və səlləm* –, Meraca yalnız ruhu ilə gedib. Lakin səhih odur ki, həm ruhu, həm də cəsədi ilə gedib və ömründə bir dəfə olub. Bu hadisə Məkkədə Peyğəmbərlikdən sonra və hicrətdən bir il əvvəl 27 Rəcəb 621- ci ildə baş verib.
[16] Cəbrail – *əleyhissəlam* –.

Adəmdir, ona salam ver!» dedi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ona salam verdi, o da salamı alıb: «Saleh övladıma və saleh Peyğəmbərə salam olsun!» dedi. (Başqa rəvayətdə: «Adəmin sağ tərəfində xoşbəxt kimsələrin ruhları, sol tərəfində isə bədbəxt kimsələrin ruhları vardır. O, sağ tərəfinə baxdıqda sevinər və gülərdi, sol tərəfinə baxdıqda isə ağlayardı. Çünki sağ tərəfində olanlar Cənnət əhli, sol tərəfində olanlar isə Cəhənnəm əhlindən olan kimsələr idi!»). Sonra Cəbrail – *əleyhissəlam* – mənimlə ikinci səmaya qalxdı və səmanın (qapısının) açılmasını istədi. Gözətçilər: «Kimdir O?» deyə soruşdular. «Cəbraildi!» dedi. Gözətçilər: «Yanında kim var?» deyə soruşdular. Cəbrail: «Muhəmməd!» deyə cavab verdi. Gözətçilər: «Ona risalət verildimi? (Yəni ona bura gəlsin deyə dəvət göndərildimi?)» deyə soruşdular. Cəbrail: «Bəli!» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi!» deyildi və ona səmanın (qapısı) açıldı. İkinci səmada Yəhya və İsa – *əleyhimussəlam* – göründü. Cəbrail – *əleyhissəlam* – dedi ki, bunlar Yəhya və İsadır, hər iksinə salam ver. O, da onlara salam verdi, onlar da salamını alıb: «Saleh qardaşımıza və saleh Peyğəmbərə salam olsun!» dedilər. Sonra Cəbrail – *əleyhissəlam* – mənimlə üçüncü səmaya qalxdı və səmanın (qapısının) açılmasını istədi. Gözətçilər: «Kimdir O?» deyə soruşdular. «Cəbraildi!» dedi. Gözətçilər: «Yanında kim var?» deyə soruşdular. Cəbrail: «Muhəmməd!» deyə cavab verdi. Gözətçilər: «Ona risalət verildimi? (Yəni ona bura gəlsin deyə dəvət göndərildimi?)» deyə soruşdular. Cəbrail: «Bəli!» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi!» deyildi və ona səmanın (qapısı) açıldı. Üçüncü səmada Yusif – *əleyhissəlam* – göründü. Cəbrail – *əleyhissəlam* – dedi ki, bu Yusifdir, ona da salam ver. O, da salam verdi, salamını alıb: «Saleh qardaşımıza və saleh Peyğəmbərə salam olsun!» dedi. Sonra Cəbrail – *əleyhissəlam* – mənimlə dördüncü səmaya qalxdı və səmanın (qapısının) açılmasını istədi. Gözətçilər: «Kimdir O?» deyə soruşdular. «Cəbraildi!» dedi. Gözətçilər: «Yanında kim var?» deyə soruşdular. Cəbrail: «Muhəmməd!» deyə cavab verdi. Gözətçilər: «Ona risalət verildimi? (Yəni ona bura gəlsin deyə dəvət göndərildimi?)» deyə soruşdular. Cəbrail: «Bəli!» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi!» deyildi və ona səmanın (qapısı) açıldı. Dördüncü səmada İdris – *əleyhissəlam* – göründü. Cəbrail – *əleyhissəlam* – dedi ki, bu İdrisdir, ona da salam ver. O, da salam verdi, salamını alıb: «Saleh qardaşımıza və saleh Peyğəmbərə salam olsun!» deyə dua etdi. (Başqa rəvayətdə: «Allah buyurur: ***«Biz onu yüksək məqama qaldırdıq».*** *(Məryəm 57).* Sonra Cəbrail – *əleyhissəlam* – mənimlə beşinci səmaya qalxdı və səmanın (qapısının) açılmasını istədi. Gözətçilər: «Kimdir O?» deyə soruşdular. «Cəbraildi!» dedi. Gözətçilər: «Yanında kim var?» deyə soruşdular. Cəbrail: «Muhəmməd!» deyə cavab verdi. Gözətçilər: «Ona risalət verildimi? (Yəni ona bura gəlsin deyə dəvət göndərildimi?)» deyə soruşdular. Cəbrail: «Bəli!» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi!» deyildi və ona səmanın (qapısı) açıldı. Beşinci səmada Musa – *əleyhissəlam* – ın qardaşı İmran oğlu Harun – *əleyhissəlam* – göründü. Cəbrail – *əleyhissəlam* – dedi ki, bu Harundur, ona da salam ver. O, da salam verdi, salamını alıb: «Saleh qardaşımıza və saleh Peyğəmbərə salam olsun!» dedi. Sonra Cəbrail – *əleyhissəlam* – mənimlə altıncı səmaya çıxdı və səmanın (qapısının) açılmasını istədi. Gözətçilər: «Kimdir O?» deyə soruşdular. «Cəbraildi!» dedi. Gözətçilər: «Yanında kim var?» deyə soruşdular. Cəbrail: «Muhəmməd!» deyə cavab verdi. Gözətçilər: «Ona risalət verildimi? (Yəni ona bura gəlsin deyə dəvət göndərildimi?)» deyə soruşdular. Cəbrail: «Bəli!» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi!» deyildi və ona səmanın (qapısı) açıldı. Altıncı səmada Musa – *əleyhissəlam* – göründü. Cəbrail – *əleyhissəlam* – dedi ki, bu Musadır, ona da salam ver. O, da salam verdi, salamını alıb: «Saleh qardaşımıza və saleh Peyğəmbərə salam olsun!» dedi. Yanından getdikdə Musa ağladı. Ondan soruşdular: «Səni ağladan nədir?». Musa: «Çünki məndən sonra Peyğəmbər olaraq göndərilən bu gəncin ümmətindən Cənnətə girəcək olanlar, mənim ümmətimdən Cənnətə girəcək olanlardan daha çoxdur! (Başqa rəvayətdə: Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İsra gecəsində Musanın yanına çatdım. Qırmızı qum təpəsinin yanındakı qəbrində idi[17])». Sonra Cəbrail – *əleyhissəlam* – mənimlə yeddinci səmaya qalxdı və səmanın (qapısının) açılmasını istədi. Gözətçilər: «Kimdir O?» deyə soruşdular. «Cəbraildi!» dedi. Gözətçilər: «Yanında kim var?» deyə soruşdular. Cəbrail: «Muhəmməd!» deyə cavab verdi. Gözətçilər: «Ona risalət verildimi? (Yəni ona bura gəlsin deyə dəvət göndərildimi?)» deyə soruşdular. Cəbrail: «Bəli!» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi!» deyildi və ona səmanın (qapısı) açıldı. Yeddinci səmada Xalilur-Rahmən İbrahim – *əleyhissəlam* – göründü. Cəbrail – *əleyhissəlam* – dedi ki, bu sənin atan İbrahimdir, ona da salam ver. O, da salam verdi, salamını alıb: «Saleh övlad və saleh Peyğəmbərə salam olsun!» dedi.

Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Sidrətul-Muntəhaya qədər yüksəldi. Bir də gördüm ki, Sidr ağacının yarpaqları fillərin qulaqları kimidir. Onun yemişləri isə (Yəmənin Həcər qəsəbəsindəki) fincanlara (gildən düzəldilmiş qablara) bənzəyirdi. Orada Sidrənin dibindən çıxan dörd çay vardı. Bu çaylardan ikisi zahiri, ikisi isə batini çaylar idi. Mən: «Ey Cəbrail! Bu nə çaylardır?» deyə buyurdum. Cəbrail: «Batini olan çaylar Cənnət çaylarıdır. Zahiri olan çaylar isə Nil və Fərat çaylarıdır». Allahın əmri ilə orada olan gözəllikləri gördüm. Artıq Allahın məxluqlarından oranın gözəlliyinin bir qismini belə təsvir və ya tərif etməyə qadir ola biləcək bir kimsə yoxdur.

Sonra Beytul-Məmura yüksəldik. (Başqa rəvayətdə: «İbrahim – *əleyhissəlam* – belini yeddinci səmadakı Beytul-Məmura söykəmişdi»). Bu Beytul-Məmura gündə yetmiş min mələk girər, orada Allaha ibadət edər,

---

[17] Müslim «Fəzail» 2375.

namaz qılar, sonra oradan çıxar və bir daha oraya qayıtmazlar. Oradan çıxdıqdan sonra Cəbrail – *əleyhissəlam* – mənə bir qab şərab və bir qab da süd gətirdi. Mən südü seçdim. Cəbrail – *əleyhissəlam* – mənə: «Sən fitrəti seçdin, ümmətin də fitrət üzərindədir. Əgər şərabı seçmiş olsaydın ümmətin haqq yoldan azardı (azğın olardı)» dedi. (Başqa rəvayətdə: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sonra Cəbrail – *əleyhissəlam* – məni yuxarıya götürə-götürə nəhayət (qəza və qədəri yazan) qələmlərin cızıltılarını eşidəcək bir səviyyəyə çatdıq!»).

Sonra Allah Muhəmməd – *sallallahu aleyhi və səlləm* – ə bir gün və bir gecədə əlli vaxt namaz fərz etdi. Peyğəmbər buna təslimiyyətlə razı oldu. Səmadan enib Musa – *əleyhissəlam* – ın yanından keçərkən: «Rəbbin ümmətinə nəyi fərz etdi?» deyə buyurdu. Mən: «O, bir gündə əlli namaz fərz etdi!» buyurdum. Musa: «Sənin ümmətinin buna gücü çatmaz. Səndən əvvəl mən öz ümmətimə bunu bəyan etmişdim. İsrail oğullarından çox çətinliklərlə qarşılaşdım. Rəbbinə qayıt və ümmətin üçün yükünün yüngülləşdirilməsini dilə!» deyə buyurdu. Mən də Rəbbimə dönüb: «Ya Rəbbim! Ümmətim üçün yüngülləşdir!» deyə buyurdum. Məndən on vaxt namaz endirildi. Sonra Musa – *əleyhissəlam* – ın yanına qayıtdım: «Məndən on namaz vaxtı endirildi!» deyə buyurdum. Musa: «Şübhəsiz ki, ümmətinin buna da gücü çatmayacaqdır. Rəbbinə dön və yüngülləşdiril-məsini dilə!» deyə buyurdu. Mən yenə də Rəbbimə dönüb: «Ya Rəbbim! Ümmətim üçün yüngülləşdir!» deyə buyurdum. Məndən (qalan namazların vaxtından) yenə də on vaxt namaz endirildi. Sonra Musa – *əleyhissəlam* – ın yanına qayıtdım: «Məndən yenə də on namaz vaxtı endirildi!» deyə buyurdum. Musa: «Şübhəsiz ki, ümmətinin buna da gücü çatmayacaqdır. Rəbbinə dön və yüngülləşdirilməsini dilə!» deyə buyurdu. Beləcə Rəbbim ilə Musa – *əleyhissəlam* – arasında beş vaxt namaz əmr olunana qədər gedib-gəldim. Sonra yenə Musa – *əleyhissəlam* – ın yanına qayıtdım və o, mənə: «Nə ilə əmr olundun?» deyə buyurdu. Mən: «Hər gün beş vaxt namaz ilə əmr olundum!» deyə buyurdum. Musa: «Sənin ümmətin hər gün beş vaxt namaz qılmağa da taqəti çatmaz. Rəbbinə dön və yüngülləşdirilməsini dilə!» deyə buyurdu. Mən: «Rəbbimdən çox istədim. Artıq ondan utanıram. Mən beş vaxta razıyam. Allahın əmrinə təslim oluram!» deyə cavab verdim. Bundan sonra bir carçı: «Fərzlər yəqinləşdi, qullarıma da (yükləri) yüngülləşdirildi!» deyə səslədi. Rəbbim: «(Namazlar) beşdir, yenə onlar əllidir. Mənim dərgahımda hökm əsla dəyişməz!». Bundan sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə Cənnət və Cəhənnəm də göstərildi. Cənnətəin içində bir çox incidən olan qübbələr (çadırlar) vardı. Torpağı da miskdən idi. Usamə b. Zeyd - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «(Merac gecəsində) Cənnətin qapısında durub içəri baxdım. Oraya girənlərin böyük çoxluğunun miskinlər olduğunu gördüm. Mal sahiblərindən Cəhənnəmlik olanlardan başqaları (haqq-hesab) üçün həps olunmuşlar. Atəş əhli olan zənginlərin isə Cəhənnəmə atılmaları öncə əmr olunmuşdur. Cəhənnəmin qapısında da durdum. Bir də baxdım ki, Cəhənnəmə girənlərin çoxu qadınlardır (Başqa rəvayətdə: «Biz nəyə görə Cəhənnəm əhlinin çox hissəsi olacağıq)» dedilər. Peyğəmbər: «Çünki çox lənət edir və ərlərnizə qarşı nankorluq edirsiniz. Yaxşılığa qarşı küfr edirsiniz. Onlardan birinə dünya durduqca yaxşılıq etsən və sonra səndən məmnun olmayacaq bir şey görsə – səndən heç bir xeyir görmədim deyər. Ağıl və din naqisliyi də vardır. Sizin qədər ağlı başından alaraq kişiyə üstün gələni görmədim». Qadınlar: «Ağıl və din naqisliyi nədir?» deyə soruşdular. Peyğəmbər: «Ağlı nöqsanlığa gəldikdə – iki qadının şahidliyi bir kişinin şahidliyinə bərabərdir. Dini naqisliyə gəldikdə isə – (heyzli günlərdə) namaz qılmazsınız və ramazanda da (bir müddət) oruc tutmazsınız»[18]. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İsra gecəsində dırnaqları uzun olan bir qövmə çatdım. Onlar üzlərini və (kökslərini) cırmaqlayırdılar». Mən: «Ey Cəbrail! Bunlar kimlərdir?» deyə soruşdum. Cəbrail: «Bunlar insanların ətlərini yeyənlərdir (qeybət edənlər)» deyə buyurdu[19]. Daha sonra Peyğəməbr – *sallallahu aleyhi və səlləm* – səmadan enib Məkkəyə geri döndü»[20]. Cabir - *radıyallahu anhu*– rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qureyş məni təqzib etdiyi vaxt Allah Beytul Məqdisi mənə təcəlli etdi. Mən onlara onun əlamətlərini bir-bir xəbər verməyə başladım. Mən Beytul Məqdisə baxır, həm də xəbər verirdim»[21]. Daha sonra Peyğəməbr – *sallallahu aleyhi və səlləm* – səmadan enib Məkkəyə geri qayıtdı»[22].

## ALTINCI HƏDİS

### (ƏBU SUFYAN –*radıyallahu anhu*– nun HERAKLLA GÖRÜŞÜ)

***«Necə ola bilər ki, onlar*** *(kitab əhli)* ***Allahın dinindən başqa bir din axtarsınlar? Halbuki, göylərdə və yerdə olanların hamısı istər-istəməz ona*** *(Allaha)* ***təslim olmuşlar və onun hüzuruna qayıdacaqlar».*** *(Ali-İmran 83).* ***«****(Ya Muhəmməd!)* ***Söylə ki, Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan bir kəlməyə tərəf gəlin! Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi*** *(özümüzə)*

[18] Buxari «Rikak» 51, Müslim 79, 2736.
[19] Əbu Davud 4870, 4879.
[20] Buxari, Müslim.
[21] Buxari, Müslim 170.
[22] Buxari 349-3887, Müslim 259-260.

***Rəbb qəbul etməyək! Əgər onlar yenə də üz döndərərlərsə, o zaman** (onlara) **deyin: İndi şahid olun ki, biz həqiqətən müsəlmanlarıq** (Allaha təslim olanlarıq)**».** (Ali-İmran 64).*

İbn Abbas – *radyallahu anhu* – deyir ki, Əbu Sufyan[23] – *radyallahu anhu* – mənə dedi: «Mənimlə Peyğəmbər – *sallallahu aleyhi və sələm* – in arasında imzalanmış sülh müqaviləsi müddətində[24] mən Qureyşin ticarət karvanı ilə birlikdə Şama[25] getmişdim. Mən Şamda olduğum müddətdə Peyğəmbər – *sallallahu aleyhi və sələm* – dən Rumun İmperatoru Herakliyusa[26] bir məktub gətirilmişdi. Bu məktubu (Rumun imperatoruna) Dihyətul Kəlbi[27] gətirmiş və Busranın əmirinə vermişdi. Busranın əmiri də məktubu Herakliyusa göndərmişdi. Herakliyus da: «Burada (yəni Şamda) Peyğəmbər olduğunu iddia edən adamın qövmündən bir kimsə varmı?» deyə xəbər aldı. Əyanları: «Bəli, vardır!» dedilər. Bundan sonra (Əbu Sufyan – *radyallahu anhu* – bir qrup yoldaşları ilə) birlikdə imperatorun hüzuruna İliyuya[28] gətrildilər. Herakl Rumun tanınmış insanlarının əhatəsində onları və tərcüməçisini öz yanına çağıraraq (tərcüməçisi vasitəsilə): «Peyğəmbər olduğunu iddia edən bu şəxsə nəsəb (qohumluq) etibarı ilə ən yaxın olanınız hansınızdır?» deyə soruşdu. Əbu Sufyan: «Nəsəb etibarı ilə ən yaxın olan mənəm» dedim. Herakl: «Onu mənə yaxın otuzdurun, yoldaşlarını isə onun arxa tərəfində otuzdurun!» dedi. Sonra Herakl tərcüməçisinə: «Mən Peyğəmbər olduğunu iddia edən o, şəxs haqqında bu adamdan bəzi şeyləri soruşacağam. Əgər o, mənə yalan desə sizlər onun yalanını təkzib edin!» dedi. Əbu Sufyan: «Allaha and olsun ki, yoldaşlarım tərəfindən yalanımın hər tərəfə yayılmasından qorxmasaydım Peyğəmbər haqqında şübhəsiz ki, yalan uydurardım» dedim. Sonra (Herakl) Peyğəmbər haqqında mənə ilk sualını verdi.

«Sizin içinizdə onun nəsəbi necədir?» deyə soruşdu. Mən: «İçimizdə onun nəsəbi çox böyükdür. O, hörmətli bir ailədəndir» deyə cavab verdim. O: «Sizdən bu sözü ondan öncə söyləmiş (yəni ondan əvvəl Peyğəmbərlik iddiası etmiş) bir kimsə olubmu?» deyə soruşdu. Mən: «Xeyr!» deyə cavab verdim. O: «Ata-babaları içərisində bir padşah olubmu?» deyə soruşdu. Mən: «Xeyr!» deyə cavab verdim. O: «Ona kimlər tabe olur. İnsanların şərəfliləri (yəni tanınmışlar, varlılar), yoxsa insanların zəifləri (kasıblar, sadələr)?» deyə soruşdu. Mən: «İnsanların zəifləri (kasıbları, sadələri)» deyə cavab verdim. O: «Ona tabe olanlar artır, yoxsa azalırlar?» deyə soruşdu. Mən: «Xeyr, azalmır. Əksinə artırlar!» deyə cavab verdim. O: «İçərilərində onun dininə girdikdən sonra bəyənməməzlikdən onun dinini tərk edən varmı?» deyə soruşdu. Mən: «Xeyr!» deyə cavab verdim. O: «Bu dediklərini deməzdən (yəni Peyğəmbərlikdən) əvvəl heç onu yalan (danışmaqda) ittiham etmisinizmi?» deyə soruşdu. Mən: «Xeyr!» deyə cavab verdim. O: «Heç əhdini pozubmı?» deyə soruşdu. Mən: «Xeyr, əhdə vəfasızlıq etməz. Lakin indi biz onunla bir müddətlik sülh müqaviləsi bağlamışıq. Bu müddət ərzində onun nə edəcəyini bilmirik. Mən bu dediklərimə heç bir söz əlavə edə bilmədim. (Yəni Peyğəmbərə qarşı heç bir söz deyə bilmədim)» deyə cavab verdim. O: «Heç onunla müharibə etdinizmi?» deyə soruşdu. Mən: «Bəli» deyə cavab verdim. O: «Onunla etdiyiniz müharibənin nəticəsi necədir?» deyə soruşdu. Mən: «Onunla bizim aramızda olan müharibə qarşılıqlı olub. O, da bizə qalib gəlib, biz də ona qalib gəlmişik» deyə cavab verdim. O: «O, sizə nəyi etməyi əmr edir?» deyə soruşdu. Mən: «O, bizə tək Allaha ibadət etməyi və Ona heç bir şeyi şərik qoşmamağı bir də ata-babalarımızın dediyi şeylərdən çəkinməyimizi əmr edir. Sonra bizə namaz qılmağı, düz söz danışmağı (yalan danışmamağı), yaxşılıq etməyi və qohumluq əlaqələrini möhkəmləndirməyi (kəsməməyi) əmr edir!» deyə cavab verdim.

Onda (Herakl) öz tərcüməçisinə əmr etdi ki, mənə desin: «Mən səndən onun nəsəbi haqqında soruşdum. Sən də: «İçimizdə onun nəsəbi çox böyükdür. O, hörmətli bir ailədəndir» deyə cavab verdin. Axı bütün (əvvəlki) Peyğəmbərlər də belə qövümlərin yüksək nəsəb sahiblərinin içindən göndərilmişlər. Mən səndən: «Sizdən bu sözü ondan əvvəl söyləmiş (yəni ondan əvvəl Peyğəmbərlik iddiası etmiş) bir kimsə olubmu?» deyə soruşdum. Sən də: «Xeyr!» deyə cavab verdin. Mən də düşündüm ki, əgər kimsə belə bir şey (Peyğəmbərlik iddiası) haqqında ondan əvvəl söyləmiş olsaydı, onda belə qərara gəlmək olardıki o, da özündən əvvəl kimsə tərəfindən deyilmiş bir sözü təkrar edir. Mən səndən: «Ata-babaları içərisində bir padşah olubmu?» deyə soruşdum. Sən də: «Xeyr!» deyə cavab verdin. Mən də düşündüm ki, əgər ata-babaları içərisində bir padşah olsaydı, onda belə qərara gəlmək olardıki o, (ata-babalarının) mülkünü geri almaq istəyən bir kimsədir. Mən səndən: «Bu dediklərini deməzdən (yəni Peyğəmbərlikdən) əvvəl heç onu yalan (danışmaqda) ittiham etmisinizmi?» deyə soruşdum. Sən də: «Xeyr!» deyə cavab verdin. (Bu sözlərdən) mənə aydın oldu ki, əgər o, insanlara qarşı yalan danışmayıbsa deməli Allaha qarşı da yalan danışmaz (uydurmaz). Mən səndən: «Ona kimlər tabe olur. İnsanların şərəfliləri (yəni tanınmışlar, varlılar), yoxsa insanların zəifləri (kasıblar, sadələr)?» deyə soruşdum. Sən də: «İnsanların zəifləri (kasıbları, sadələri)» deyə cavab verdin. Məhz (Peyğəmbərlərə) tabe olanlarda onlardır. Mən səndən: «Ona tabe olanlar

---

[23] Əbu Sufyan b. Hərb – *radyallahu anhu* – 630-cu ilə qədər Peyğəmbər – *sallallahu aleyhi və sələm* – in qatı düşmənlərindən olub. Lakin Məkkənin fəthi günü İslamı qəbul edir. Qızı Ramlə b. Əbu Sufyan (həmçinin Ummu Həbibə də deyirdilər) Peyğəmbər – *sallallahu aleyhi və sələm* – in yoldaşı idi.

[24] ***HUDEYBIYYƏ*** – Qureyş müşrikləri ilə Peyğəmbər – *sallallahu aleyhi və sələm* – arasında bağlanmış sülh müqaviləsidir. Mart 628-ci il Məkkə yaxınlığında.

[25] ***ŞAM*** – indiki Livan, Suriya, İordaniya və Fələstinin ərazisi sayılır.

[26] ***HERAKL*** – Bizans imperatoru 610-641-ci illərdə hökmranlıq edib.

[27] Səhabələr içərisində gözəlliyi ilə seçilən bir səhabə idi. Cəbrail – *əleyhissəlam* – əksər vaxtlarda onun görkəmində gələrdi.

[28] ***İLIYU*** - Yerusəlimin qədim adlarından biridir. (Həmçinin Beytul Məqdis, Qüds).

artır, yoxsa azalır?» deyə soruşdum. Sən də: «Xeyr, azalmır. Əksinə artırlar» deyə cavab verdin. Məhz iman da belədir. (Qəlbə girdimi) kamillik dərəcəsinə çatana qədər artar. Mən səndən: «İçərilərində onun dininə girdikdən sonra bəyənmədən onun dinini tərk edən varmı?» deyə soruşdum. Sən də: «Xeyr!» deyə cavab verdin. Məhz həqiqi iman da belədir. Qəlbə girib orada (kök atdıqda). Mən səndən: «Heç əhdini pozarmı?» deyə soruşdum. Sən də: «Xeyr, əhdə vəfasızlıq etməz!» deyə cavab verdin. Peyğəmbərlər də heç vaxt əhdə vəfasızlıq etməzlər. Mən səndən: «Heç onunla müharibə etdinizmi?» deyə soruşdum. Sən də: «Bəli» deyə cavab verdin. Mən: «Onunla etdiyiniz müharibənin nəticəsi necədir?» deyə soruşdum. Sən də: «Onunla bizim aramızda olan müharibə qarşılıqlı olub. O, da bizə qalib gəlib, biz də ona qalib gəlmişik» deyə cavab verdin. Peyğəmbərlər də belədirlər. Onlar (Allah tərəfindən səbr etdiklərinə görə əcrləri böyük olsun deyə) bəlalara düçar olurlar. Lakin sonra yaxşı aqibət onların leyhinə olur. Mən səndən: «O, sizə nə etməyi əmr edir?» deyə soruşdum. Sən də: «O, bizə tək Allaha ibadət etməyi və ona heç bir şeyi şərik qoşmamağı, bütlərə ibadətdən çəkinməyimizi əmr edir. Sonra bizə namaz qılmağı, düz söz danışmağı (yalan danışmamağı) və yaxşılıq etməyi əmr edir» deyə cavab verdin. Əgər o, şəxs haqqında dediklərin doğrudursa, yəqinliklə söyləyirəm ki, onun mülkü mənim bu iki ayaqlarımın altında olan yerlərə qədər çatacaqdır. Şübhəsiz ki, mən onun çıxacağını bilirdim. Lakin onun sizdən olacağını düşünmürdüm. Əgər mən əmin olsaydım ki, ona çata biləcəyəm, onunla görüşmək üçün çalışardım. Əgər onunla görüşsəydim mütləq ona (xidmət edərək) ayaqlarını yuyardım» dedi və sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in məktubunu istədi. Məktubu gətirən şəxs onu Herakla verdi. Məktubu açaraq oxumağa başladı. Orada bunlar yazılmışdır.

«Rahmən və Rahim olan Allahın adı ilə. Allahın Rəsulu Muhəmməd – *sallallahu aleyhi və səlləm* – dən Rumun İmperatoru Herakla! Salam olsun doğru yolda olanlara! Sonra: «(Ey Rum imperatoru!) Mən səni İslama dəvət edirəm. İslamı qəbul et və canını qurtar. Allah da sənin əcrini iki qat versin. Əgər bu dəvətimi qəbul etməzsənsə ətrafındakı Xristianların da günahı sənin boynunadır. ***«(Ya Muhəmməd!) Söylə ki, Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan bir kəlməyə tərəf gəlin! Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi*** *(özümüzə)* ***Rəbb qəbul etməyək! Əgər onlar yenə də üz döndərərlərsə, o zaman*** *(onlara)* ***deyin: İndi şahid olun ki, biz həqiqətən müsəlmanlarıq.*** *(Allaha təslim olanlarıq)». (Ali-İmran 64).*

Əbu Sufyan: «(Herakl) deyəcəklərini dedikdən və məktubu oxuduq-dan sonra yanında səslər yüksəldi və gurultu çoxaldı. Bizim çıxarılmağı-mızı əmr etdi. Biz də onun yanından çıxarıldıq. Çıxarıldığımız zaman mən yoldaşlarıma: «İbn Əbu Kəbşə[29] o, qədər mühüm bir insandır ki, hətta ondan Bəni Əsfarın[30] məliki də qorxur. Artıq o, vaxtdan (Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in) qalib gələcəyinə və Allahın İslamı qəlbimə yerləşdirdiyi günə qədər əmin olmaqda davam etdim».

İbn ən-Natur İliya (yəni Beytul Məqdisin) əmiri idi. Herakl isə Şamın Xristianlarının yepiskopu idi. (İbn ən-Natur) deyir ki: «Herakl İliyu (yəni Beytul Məqdisə) gəldiyi zaman günlərin birində səhər çox kədərli göründü». Patriklərindən[31] bəziləri ona: «Sənin halın bizim xoşumuza gəlmir» dedilər. İbn ən-Natur: «Herakl münəccim[32] və gələcəkdən xəbər verən bir kimsə (kahin) olduğu üçün onların sualına belə cavab verdi: «Bu gecə ulduzlara baxdıqda gördüm ki, sünnətlər məliki zühr edib (qalib gəlib). (Mən də bilmək istəyirəm) bu ümmət içərisində sünnət olunanlar kimlərdir!» dedi. Ona: «Yəhudilərdən başqa sünnət olunan yoxdur. Bu da səni narahat etməməlidir. Öz məmləkətinin şəhərlərinə məktublar göndər ki, oradakı Yəhudiləri öldürsünlər!» dedilər. Bu vaxt Heraklın hüzuruna Qassani[33] məliki tərəfindən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – haqqında xəbər gətirən bir nəfər gətirilir. (Herakl) o, kimsəni sual-cavab etdikdən sonra öz (əlaltılarına) əmr edir ki, o kimsənin sünnətlimi, yoxsa sünnətsizmi olduğunu yoxlasınlar. Onlar yoxladıqdan sonra sünnətli olduğunu bildirdilər. Bundan sonra Herakl o, kimsədən ərəblər haqqında soruşmağa başladı. (O, da) onların da sünnət olunduq-larını xəbər verdi. (Qulaq asdıqdan sonra) Herakla aydın olur ki, sünnətlər məliki onların içindəndir (yəni ərəblərdəndir). Sonra Herakl Rumiyyədə (yəni Romada) elmdə onun kimi olan bir dostuna məktub yazaraq Xımsa[34] yollanır. Bu şəhərdən dostundan cavab məktubu gəlincəyə qədər ayrılmır. (Məktubda isə) Peyğəmbərin zühur etdiyi və bu şəxsin həqiqi Peyğəmbər olduğu haqqında mənim sözlərimə (fikirlərimə) uyğun bir məktub gəldi. Herakl Xımsda Rumun böyüklərini hüzuruna dəvət etdi. Dəvət olunanlar saraya daxil olduqdan sonra (sarayın) qapılarının bağlanmasını əmr etdi. Sonra hündür bir yerə çıxaraq: «Ey Rum cəmaatı! Haqq yoluna yönəlmək və mülkünüzün qalmasını istəyirsinizsə bu Peyğəmbərə beyət edin!» deyə xitab etdi. (Bu sözləri eşidcək) onlar vəhşi eşşəklər kimi qapılara doğru qaçmağa başladılar. Lakin qapıların bağlı olduqlarını gördülər. (Herakl) bu dərəcədə nifrətin və onun sözlərinin (onlar üçün) heç bir əhəmiyyət kəsb etmədiyini, onların iman gətirməyəcəklərinə ümüdünü

---

[29] ***İBN ƏBU KƏBŞƏ*** – Əbu Kəbşənin oğlu deməkdir. Əbu Kəbşə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – atası deyildir. Bəzi rəvayətlərə görə – Müşriklər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əbu Kəbşə adında olan bir kimsəyə nisbət edərək çağırırdılar. Bu kimsə bütlərə ibadət etməkdə Qureyşə müxalif olaraq Şıral Abur adında olan ulduza ibadət edirdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də bütlərə ibadət etməkdə Qureyşə müxalif olduğu üçün ona Əbu Kəbşənin oğlu deyə çağırırdılar. Bir rəvayətə görə də anası tərəfdən babalarından idi.

[30] Ərəblər Rumu belə adlandırırdılar.

[31] Rumluların bir kimsəyə verdikləri yüksək rütbə.

[32] Ulduzlar haqqında elmi öyrənən insana verilən ad – Astroloq.

[33] ***QASSANILƏR*** – ərəb knyazlığı.

[34] ***XIMS*** – Suriya ərazisində şəhərdir.

kəsərək: «Onları geri çağırın!» deyə əmr etdi. (Onlar qayıtdıqda) O: «Mən bu sözləri yalnız sizi dininizə bağlılığınızı yoxlamaq üçün söylədim. İndi isə (sizin dininizə bağlılığınıza) gözlərimlə şahidi oldum!» deyə cavab verdi. Bu sözlərdən sonra oradakılar (öz məmnuniyyətlərini bildirməkdən ötrü) onun qarşısında təzim olaraq səcdəyə qapandılar. Bu da Heraklı (İslam ilə bağlayan) son hadisə idi»[35].

# YEDDİNCİ HƏDİS
## (HUDEYBİYYƏ SÜLHÜ)

***«Sizi onlara** (müşriklərə) **qalib etdikdən sonra Məkkə vadisində** (Hudeybiyyədə) **onların əlini sizdən, sizin də əlinizi onlardan çəkən** (onları sizinlə, sizi də onlarla vuruşmağa qoymayan) **Odur. Allah sizin nə etdiyinizi görəndir!».** (əl-Fəth 24).*

Misvər b. Məxrəmə - *radıyallahu anhu* – və Mərvan b. əl-Həkəm bir-birinin rəvayətini təsdiqləyərək demişlər: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Hudeybiyyə sülhündə[36] iştirak etmək üçün (Mədinədən səfərə) çıxdı və bir qədər yol getdikdən sonra səhabələrinə belə buyurdu: «Xalid b. Vəlid[37] - *radıyallahu anhu* – nun başçılıq etdiyi Qureyşin süvari qoşunu Ğəmim vadisində pusquda dayanıblar. Buna görə də siz sağ tərəfə gedin!» Allaha and olsun ki, Xalid - *radıyallahu anhu* –, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – və onun səhabələrini görmədi. Yalnız onların arxasınca qalxan toz-torpağı gördükdən sonra atını çaparaq (müsəlmanların gəldiyini) Qureyşə xəbər verməyə getdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – isə (səhabələrilə birlikdə) yoluna davam etdilər. Nəhayət gəlib Məkkəyə aparan Hudeybiyyə vadisindəki dağ yoluna çatdılar. Burada Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dəvəsi yerə çökdü və insanlar: «Hü! Hü!» deyə dəvəni yerindən tərpətməyə çalışdılar. Lakin dəvə çökdüyü yerdən qalxmadı və onlar: «Qasva[38] inadkarlıq edib qalxmır!» dedilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qasva inadkarlıq etməz! Bu onun adəti deyildir. Lakin (bir zamanlar Məkkəyə daxil olmaq istəyən) fili tutub saxlayan Allah indi də Qasvani saxladı. Nəfsim əlində olan Allaha and olsun ki, müşriklər Allahın haram buyurduqlarına əməl etməklə məndən hər nə istəsələr onlara istədiklərini verəcəyəm!» Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Qasvanı tərpətdi və heyvan dərhal ayağa qalxdı. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Hudeybiyyənin qurtaracağında yerləşən və içində az miqdarda su olan çuxurun yanına gəldi. Səhabələr çuxurda olan sudan az-az o, qədər daşıdılar ki, orada su qurtardı. Onlar susuzluqdan Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə şikayət etdikdə o, ox qabından bir ox çıxardıb onlara verdi və onu çuxura sancmaqlarını əmr etdi. Allaha and olsun ki, ox çuxura sancılan kimi oradan su fəvvarə kimi vurmağa başladı. Bu fəvvarə onlar susuzluqlarını yatırdıb oradan uzaqlaşanadək davam etdi. Bu vaxt Budeyl b. Vərqa əl-Xuzai - *radıyallahu anhu* – öz qəbiləsindən Xuzaədən olan bir dəstə adam ilə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldilər. Tihaməlilər[39] içərisində Xuzaə qəbiləsindən olanlar əvvəldən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sirdaşı idilər. Budeyl - *radıyallahu anhu* – dedi: «Mən Kəb b. Lueyyi və Amir b. Lueyyi[40] Məkkədə tərk edib gəlmişəm. Onlar Hudeybiyyə vadisindəki ən zəngin su quyularını ələ keçiriblər. Səninlə müharibə etmək və Məkkəyə daxil olmağına mane olmaq istəyirlər. (Uzun müddət müqavimət göstərib qaçmamaq üçün) özləri ilə süd verən və balası yanında olan dişi dəvələr də (və ya arvad-uşaqlarını da) gətiriblər». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Biz müharibə etmək üçün gəlməmişik! Biz yalnız Ümrə ziyarəti etmək üçün gəlmişik. Həqiqətən müharibə Qureyşi maddi və mənəvi cəhətdən zəiflətmiş, onları ziyana uğratmışdır. Əgər istəyirlərsə müharibəni dayandırıb onlarla sülh müqaviləsi bağlayım. Qoy onda mənimlə digər insanlar (ərəblərdən və qeyri ərəblərdən olan kafirlər) arasında olan münasibətə qarışmasınlar. Əgər mən o, kafirlərə məğlub olsam bu onlar üçün bir dəstək olacaq, yox əgər qalib gəlsəm onda onlar da digərləri kimi İslam dininə daxil ola bilərlər. Əks halda isə (Allah və onun Rəsuluna itaət etməsələr) mən onlarla bağladığım müqaviləni pozmayacağam. Beləliklə də onlar istirahət edəcəklər (bir müddət müharibədən yaxa qurtaracaqlar). Onlar mənim bu təklifimi qəbul etməyib bizim içimizə müdaxilə etsələr, nəfsim əlində olan Allaha and olsun ki, başım bədənimdən ayrılana qədər onlarla vuruşacağam. O, zaman Allah Öz vədini (İslam dinini ucaldacağını) mütləq doğruldacaqdır!».

Budeyl - *radıyallahu anhu* – dedi: «Sənin dediklərini onlara çatdıracağam!» Sonra o, Qureyşlilərin yanına gəlib dedi: «Biz Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına getdik və ondan bəzi şeylər eşitdik. İstəyirsinizsə onun dediklərini sizə çatdırım!». Onların arasındakı səfehlər: «Ondan bizə hər hansı bir xəbər verməyinə ehtiyacımız yoxdur!» deyə etirazlarını bildirdilər. Ağıllıları isə: «De görək ondan nə eşitmisən!» deyə soruşdular. O: «Mən ondan filan, filan təklifləri eşitdim!» deyib Peyğəmbər – *sallallahu aleyhi və*

---

[35] Buxari 7, Müslim 1773.
[36] ***HUDEYBIYYƏ*** – Bu sülh müqaviləsi 628-ci ildə baş verib. Sülh müqaviləsində iştirak edənlərin sayı 1400, bir rəvayətdə isə 1500 nəfər idi. Müslim, Həkim və s.
[37] Xalid b. Vəlid - *radıyallahu anhu* – o, vaxtlar hələ müsəlman deyildi. Lakin 629-cu ildə İslamı qəbul edir və İslamın dahi şəxslərindən birinə çevrilir. ***SEYFULLAH*** – Allahın qılıncı adı ilə tanınmışdır.
[38] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dəvəsinin adı idi.
[39] Məkkə və onun ətrafına Tihamə deyilir. Orada yaşayanlar isə Tihaməlilər adlanır. Fəthul Bəri 5/396.
[40] Hər ikisi də Qureyşin ulu babalarındandır. Yəni: «Onların nəslindən olanları Məkkədə tərk edib gəlmişəm» deməkdir. Fəthul Bəri 5/398.

*səlləm* – dən eşitdiklərini bir-bir onlara çatdırdı. Sonra Urva b. Məsud ayağa qalxıb: «Mən sizin valideiniz, siz də mənim övladlarım hesab olunmursunuzmu?» dedi[41] Onlar: «Bəli!» deyə cavab verdilər. O, yenə soruşdu: «Siz məni günah etməkdə ittiham edirsinizmi?» Onlar: «Xeyr!» deyə cavab verdilər. O, bir daha soruşdu: «Ukaz əhlini sizin köməyinizə çağırdığımı və onlar sizə yardım göstərməkdən imtina etdikdən sonra əhli-əyalımla, övladlarımla və mənə tabe olanlarla birlikdə sizə yardım etməyə gəldiyimi bilirsinizmi?» Onlar: «Bəli, bilirik!» deyə cavab verdilər. Urva dedi: «Həqiqətən, bu adam sizə xeyir, əmin-amanlıq və islah olunmağınızı təklif edir. Onun dəvətini qəbul edin və mənə də onunla danışıq aparmağa izn verin!» Onlar: «Gedə bilərsən!» deyə cavab verdilər. O, danışıq aparmaq üçün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Budeyl - *radıyallahu anhu* – ya dediklərini Urvaya da dedi.

Urva dedi: «Ey Muhəmməd! Sən öz qövmünü bu şəkildəmi islah olunmasını istəyirsən? (Sən onları məhv etmək istəyirsən?). Heç ərəblərdən öz qövmünü məhv edən bir kəs barəsində eşitmisənmi? Bəs onlar sənə qalib gəlsələr necə? Allaha and olsun ki, mən sənin tərəfdarların arasında cəsarətli üzlər görmürəm. Mən burada bir çox insanlar görürəm ki, onlar səni müharibə başlayan kimi qoyub qaçacaqlar!» Əbu Bəkr - *radıyallahu anhu* – (Urvanın bu dediklərinə dözməyib) dedi: «Get Latın[42] fərcini sor! Sən elə zənn edirsən ki, biz onu qoyub qaçacağıq?!» O: «Bu kimdir?» deyə soruşdu. Səhabələr: «Bu Əbu Bəkr - *radıyallahu anhu* – dur!» deyə cavab verdilər. O: «Nəfsim əlində olana and olsun ki, bir zamanlar mənə göstərdiyin və əvəzini vermədiyim qayğı olmasaydı sənin cavabını verərdim!» deyib Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə söhbətinə davam etdi. O, danışdıqca (hər dəfə söz söylədikdən sonra ərəblərin adətinə görə) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in saqqalından tutardı. Bu vaxt Muğira b. Şöbə - *radıyallahu anhu* – əlində qılınc və başında dəmir dəbilqə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanında dayanıb onu qoruyurdu. Urva Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in saqqalına əl atdıqca Muğira - *radıyallahu anhu* – qılıncın qını ilə onun əlindən vurur və ona: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in saqqalından əl çək!» deyirdi. Urva başını qaldırıb: «Bu kimdir?» deyə soruşdu. Onlar: «Bu Muğira b. Şöbə - *radıyallahu anhu* – dir!» deyə cavab verdilər. O: «(Üzünü ona tutaraq) Ey xain! Mən hələ də sənin xainliyin nəticəsində (Səqif qəbiləsi ilə aramızda) baş verən anlaşılmazlıqları həll etməklə məşğulam!» dedi. Cahiliyyə dövründə Muğira - *radıyallahu anhu* – bir dəstə adam (Səqif qəbiləsindən olan Məlikin oğulları) ilə yol yoldaşı olmuş və yolda onları öldürərək mallarını götürüb Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gələrək İslamı qəbul etmişdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ona belə buyurmuşdu: «İslam dininə daxil olduğunu səndən qəbul edirəm, lakin qəsb etdiyin malı qəbul etmirəm!». Sonra Urva Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələrinə nəzər saldı və (öz yoldaşlarının yanına qayıdaraq) dedi: «Allaha and olsun ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in ağzından çıxan tüpürcək onlardan birinin ovucuna düşsə, bu tüpürcəyi üzünə və bədəninə sürtər, onlara bir şey əmr etdikdə dərhal onu yerinə yetirərdilər. Dəstamaz aldığı sudan (alıb qurtardıqdan sonra) əldə etmək üçün öz aralarında mübarizə edərdilər. Onun yanında danışanda səslərini qaldırmır və hörmət əlaməti olaraq onun üzünə baxmırdılar».

Sonra Urva tərəfdarlarının yanına qayıdaraq: «Ey qövmüm! Mən bir nümayəndə kimi çox padşahların: «Qeysərin, Xosrovun, Nəcaşinin və s. hüzurunda olmuşam. Padşahların tərəfdarlarının onlara necə təzim etdiklərini də görmüşəm. Lakin Muhəmməd – *sallallahu aleyhi və səlləm* – in səhabələrinin ona təzim etdikləri kimi heç bir padşaha təzim olunduğunu görməmişəm. Allaha and olsun ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in ağzından çıxan hər bir tüpürcək onlardan birinin ovucuna düşsə, bu tüpürcəyi üzünə və bədəninə sürtər, onlara bir şey əmr etdikdə dərhal onu yerinə yetirərdilər. Dəstamaz aldığı sudan (alıb qurtardıqdan sonra) əldə etmək üçün öz aralarında mübarizə edərdilər. Onun yanında danışanda səslərini qaldırmır və hörmət əlaməti olaraq onun üzünə baxmırdılar! Həqiqətən o, sizə xeyir, əmin-amanlıq və islah olunmağınızı təklif edir. Onun təklifini qəbul edin!»

Bənu Kinanə qəbiləsindən olan bir kişi dedi: «İzn verin mən gedib onunla danışım!» Onlar: «Gedə bilərsən!» deyə cavab verdilər. O, səhabələrin yanına yaxınlaşdıqda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bu gələn filankəsdir. O, elə bir tayfadandır ki, onlar qurbanlıq dəvələrinə çox hörmət edir və onları qiymətləndirirlər. Elə isə qurbanlıq dəvələrini ona tərəf sürün!». Səhabələr dərhal qurbanlıq dəvələrini sürüb təlbiyə[43] edərək onu qarşıladılar. O, təlbiyə edərək gələn səhabələri və qurbanlıq dəvələrini gördükdə: «Subhənəllah! Onlar Allahın evini ziyarət etməkdən məhrum olunmağa layiq deyillər!» dedi. Sonra o, tərəfdarlarının yanına gəlib: «Mən onların ümrə ziyarətində kəsəcəkləri, üzərlərində qurbanlıq nişanələri olan dəvələrini də gördüm. Düşünürəm ki, Allahın evini ziyarət etməyə onlara mane olmamalıyıq!» dedi.

Bu vaxt Mikrəz b. Həfs adlı bir kişi ayağa qalxıb dedi: «İzn verin mən gedib onunla danışım!» Onlar: «Gedə bilərsən!» deyə cavab verdilər. O, səhabələrin yanına yaxınlaşdıqda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bu gələn Mikrəzdir, o xain bir kimsədir!». O, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə söhbət etdiyi vaxt Suheyl b. Amr onların yanına gəldi. Məmər deyir ki, Əyyub İkrimədən xəbər verir ki,

---

[41] Başqa rəvayətdə: «Mən sizin övladınız, siz də mənim valideynim hesab olunmursunuzmu?» Fəthul Bəri 5/399.

[42] Müşriklərinin ibadət etdikləri bütün adıdır.

[43] Həcc vaxtı duadır. /Ləbbeykə-Allahummə-Ləbbeykə/.

Suheyl[44] b. Amr gəldikdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabələrə buyurmuşdu: «Artıq sizin bütün işləriniz yüngülləşdi!»

Məmər xəbər verir ki, Zuhri rəvayətinə davam edib demişdir: «Suheyl b. Amr Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəlib: «Gəl bizimlə sizin aranızda (on illik)[45] sülh müqaviləsi bağlayaq!» Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – katibi (Əli b. Əbu Talib - *radıyallahu anhu* – nu) yanına çağırıb müqaviləni yazmağı ona əmr edib buyurdu: «Yaz! Rəhimli və Mərhəmətli Allahın adı ilə ***/BİSMİLLƏHİR-RAHMƏNİR-RAHİM/***» Suheyl b. Amr: «O, ki, qaldı Rahmənə, Allaha and olsun ki, mən onu tanımıram! Biz bir vaxtlar yazdığımız kimi «Allahım! Sənin adın ilə başlayıram ***/BİSMİKƏ ALLAHUMMƏ/*** yaz!» dedi. Bu vaxt müsəlmanlar: «Allaha and olsun ki, biz yalnız ***/BİSMİLLƏHİR-RAHMƏNİR-RAHİM/*** yazacağıq!» deyə etiraz etdilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – katibinə əmr edərək: «Yaz! Allahım sənin adınla başlayıram! Bu Allahın elçisi Muhəmmədin bağladığı sülh müqaviləsidir!» Suheyl yenə etiraz edərək: «Əgər biz sənin Allahın elçisi olduğunu etiraf etsəydik Onun evini ziyarət etməyə sənə mane olmazdıq və səninlə müharibə etməzdik. Elə isə yaz – Muhəmməd b. Abdullah!» dedi. Peyğəmbər: «Baxmayaraq ki, siz məni təkzib edirsiniz, amma Allaha and olsun ki, həqiqətən mən Allahın elçisiyəm!» Katibinə əmr edərək: «Muhəmməd b. Abdullah» yazmağı əmr etdi. (Başqa rəvayətdə: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əli - *radıyallahu anhu* – ya: «Rəsulullah – sözünü silməyi əmr etdi». Əli: «Xeyr, Vallahi onu silməyəcəyəm!» dedi. Bu dəfə Peyğəmbər: «Onun yerini mənə göstər!» deyə buyurdu. Peyğəmbər öz əli ilə oranı silərək «İbn Abdullah!» sözünü yazdırdı). (Başqa rəvayətdə: «Sülh müqaviləsi imzalanandan sonra otuza[46] yaxın silahlanmış gənc bizə tərəf hücum etdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Allaha dua etdi və onların gözləri kor oldu. Biz onları əsir tutub Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gətirdik. O: «Siz kiminləsə müqavilə bağlamağa gəlmisiniz, yoxsa kimsə sizin təhlükəsizliyinizə zəmanət verib?». Onlar: «Xeyr!» deyə cavab verdilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onlara heç bir cəza verməyib hamısını azad etdi və Uca Allah bu ayəni nazil etdi: ***«Sizi onlara*** *(müşriklərə)* ***qalib etdikdən sonra Məkkə vadisində*** *(Hudeybiyyədə)* ***onların əlini sizdən, sizin də əlinizi onlardan çəkən*** *(onları sizinlə, sizi də onlarla vuruşmağa qoymayan)* ***Odur. Allah sizin nə etdiyinizi görəndir!».*** *(əl-Fəth 24)[47]).*

Zuhri deyir ki: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Suheylin dedikləri ilə razılaşdı, çünki o: «Nəfsim əlində olana (Allaha) olsun ki, müşrüklər Allahın haram buyurduqlarına əməl etməklə məndən hər nə istəsələr onlara istədiklərini verəcəyəm!» deyə söz vermişdir. Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ona ilk şərtini təklif edərək: «Allahın evini təvaf etməkdə bizə əngəl törətməyəcəksiniz!» deyə buyurdu. Suheyl: «Xeyr! Allaha and olsun ki, bu dəfə təvaf etməyə sizə izn verməyəcəyik. Çünki ərəblər: «Müsəlmanlar bizim müqavimətimizi qırdılar və bizi məcbur etdilər» deyə şayələr buraxacaqlar. Elə isə gələn ildən etibarən istədiyiniz qədər Allahın evini ziyarət edə bilərsiniz!» dedi. Əli - *radıyallahu anhu* – onun dediklərini yazdı. Sonra Suheyl ikinci şərti təklif edib: «Bizim tərəfdən sənin yanına gələn hər bir adamı hətta sənin dinini qəbul etsə belə geri qaytarmalısan!» dedi. Müsəlmanlar heyrətlə: «Subhənəllah! Müsəlman olub yanımıza gələn bir kimsə müşriklərə qaytarıla bilərmi?!». Onlar bu məsələni müzakirə edərkən Əbu Cəndəl b. Suheyl b. Amr - *radıyallahu anhu* – ayaqları qandallanmış vəziyyətdə onların yanına gəldi. (Əbu Cəndəl[48]- *radıyallahu anhu* – İslam dinini qəbul etdiyi üçün Məkkəlilər onu həbs etmişdilər). O, Məkkənin aşağısında həbs olunduğu yerdən qaçmış və nəhayət özünü müsəlmanlara çatdırmışdır. Bu vaxt Suheyl: «Ey Muhəmməd! Bu müqavilənin ilk maddəsinə əsasən onu mənə qaytarmalısan!» dedi. Peyğəmbər: «Biz hələ müqaviləni tamamlamamışıq!». O: «Allaha and olsun ki, belə olduğu təqdirdə mən də sənin heç bir təklifinlə razı olmayacağam!» Peyğəmbər: «Sən Əbu Cəndəl - *radıyallahu anhu* – nu bu müqavilədən istisna et və onu mənə bağışla!». O: «Mən onu qoyduğumuz şərtdən istisna edib sənə bağışlaya bilmərəm!». Peyğəmbər: «Sən gəl razı ol, onu mənə bağışla!». Suheyl qətiyyətlə rədd edib: «Mən heç cür sənin dediyinə əməl edə bilmərəm!». Bu zaman Mikrəz dedi: «Onu özünüzdə saxlamağa sənə icazə verdik!» (Müqavilə bağlayan Suheyl isə buna razılıq vermədi). Əbu Cəndəl: «Ey müsəlman camaatı! Artıq müsəlman olub sığınacaq tapmaq üçün sizin yanınıza gəldim. İndi də məni müşriklərə təhvil verirsiniz? Mənim əzab-əziyyətlərə məruz qaldığımı görmürsünüzmü?» dedi. O, Allah yolunda müşriklərin çox ağır işkəncələrinə məruz qalmışdı.

Ömər b. əl-Xəttab - *radıyallahu anhu* – deyir ki, o zaman mən (dözməyib) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dedim: «Məgər sən Allahın haqq Peyğəmbəri deyilsənmi?» O: «Bəli!» deyə cavab verdi. Mən dedim: «Məgər biz haqq yolunda, düşmənlərimiz isə batil yolda deyillərmi?» O: «Bəli!» deyə cavab verdi. (Başqa rəvayətdə: «Məgər bizim ölülərimiz Cənəttdə, onların ölüləri Cəhənnəmdə deyilmi?» O: «Bəli!» deyə cavab verdi). Mən: «Elə isə nə üçün nöqsan və qüsurların dinimizə daxil olmasına imkan verməliyik?» deyə soruşdum. O: «Həqiqətən mən Allahın elçisiyəm və heç vaxt Ona asi olmuram! Məhz Allah mənə yardım

---

[44] ***SUHEYL*** – asanlıq deməkdir.
[45] Bu müqavilə yalnız iki il davam etmişdir. Fəthul Bəri 5/404.
[46] Bir rəvayətdə – səksənə yaxın silahlanmış gənc bizə hücum etdilər. Müslim 1808.
[47] İmam Əhməd «Musnəd» 4/86, Beyhəqi «Sünnən» 6/319, Həkim «Müstədrək» 2/461.
[48] Müqaviləni imzalayan Suheylin oğludur.

edir!» deyə cavab verdi. Mən: «Məgər sən bizə «Bu yaxınlarda Allahın evinə gedib onu təvaf edəcəyik!» deyə xəbər verməmişdinmi?» O: «Elədir! Məgər mən sənə məhz bu il təvaf edəcəyimizi xəbər vermişdim?» deyə cavab verdi. Mən: «Xeyr!» deyə cavab verdikdə o, buyurdu: «(Yaxın zamanlarda) Sən mütləq gedib Kəbəni təvaf edəcəksən!». Sonra mən Əbu Bəkr - *radıyallahu anhu* – nun yanına gəlib dedim: «Məgər bu adam Allahın haqq Peyğəmbəri deyilmi?» O: «Bəli, elədir!» deyə cavab verdi. Mən: «Məgər biz haqq yolunda, düşmənlərimiz isə batil yolda deyillərmi?» O: «Bəli, elədir!» deyə cavab verdi. Mən: «Elə isə nə üçün nöqsan və qüsurların dinimizə daxil olmasına imkan verməliyik?» deyə soruşdum. Əbu Bəkr: «Ey insan! Həqiqətən o Allahın elçisidir və heç vaxt Rəbbinə asi olmur! Allah onun yardımçısıdır. Elə isə onun sünnəsindən yapış (əmr və qadağalarına riayət et!) Allaha and olsun ki, o haqq üzərindədir!» deyə cavab verdi. Mən: «Məgər o bizə «Bu yaxınlarda Allahın evinə gedib onu təvaf edəcəyik!» deyə xəbər verməmişdimi?» O: «Bəli, elədir. Məgər o sənə məhz bu il təvaf edəcəyini xəbər vermişdi?» deyə soruşdu. Mən: «Xeyr!» deyə cavab verdikdə o, dedi: «(Yaxın zamanlarda) Sən mütləq gedib Kəbəni təvaf edəcəksən!» (Başqa rəvayətdə: «Bu hadisədən sonra Fəth surəsinin ayələri nazil oldu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dərhal Ömər - *radıyallahu anhu* – ya xəbər göndərdi və bunu ona oxudu!». Ömər: «Ya Rəsulullah! Fəth budurmu? Deyə soruşdu. Peyğəmbər: «Bəli!» deyincə Ömərin qəlbi rahatlandı). Zuhri xəbər verir ki, Ömər - *radıyallahu anhu* – dedi: «Bu əməlimdən sonra (kəffarə olaraq) bir çox xeyirli işlər görmüşdüm».

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – sülh müqaviləsini bağladıqdan sonra səhabələrinə: «Qalxın, qurbanlarınızı kəsin, başınızı qırxın!» deyə buyurdu. Allaha and olsun ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bunu üç dəfə təkrar etdi, lakin səhabələrdən heç biri ayağa qalxmadı. Səhabələrin yerlərindən tərpənmədiyini görən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Ummu Sələmə - *radıyallahu anhə* – nin yanına daxil olub onların bu etinasızlığını ona xəbər verdi. Ummu Sələmə: «Ey Allahın elçisi! İstəyirsənsə onlar sənin əmrinə tabe olsunlar, bayıra çıx, sonra qurbanlıq dəvələrini kəsməyincə və dəlləyini çağırıb başını qırxdırmayınca onlara bir kəlmə də belə demə!» O, bayıra çıxıb qurbanlıq dəvələrini kəsdi, dəlləyini (Xuzaə qəbiləsindən olan Xəraş b. Umeyyəni - *radıyallahu anhu* –) çağırıb başını qırxdırdı və onlara heç bir söz də demədi. Bunu görən səhabələr dərhal qalxıb dəvələrini kəsdilər və bir-birlərinin başlarını qırxmağa başladılar. Hətta iş o, yerə çatdı ki, (onun əmrini daha tez yerinə yetirmək üçün baş vermiş çaxnaşma nəticəsində) səhabələr bilmədən az qala bir-birlərini öldürmüşdülər.

Sonra mömin qadınlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – yanına hicrət etdilər və Uca Allah bu ayəni nazil etdi: ***«Ey iman gətirənlər! Mömin qadınlar sizin yanınıza mühacir kimi gəldikləri zaman onları imtahana çəkin. Allah onların imanını çox gözəl bilir*** *(onları yoxlayıb bilmək sizə lazımdır)**. Əgər bu qadınların*** *(həqiqi)* ***mömin olduqlarını bilsəniz, artıq onları kafirlərin yanına qaytarmayın. Nə bu qadınlar onlara*** *(kafirlərə),* ***nə də onlar bu qadınlara halaldır. Onların*** *(kafirlərin)* ***həmin qadınlara xərclədiklərini*** *(mehri)* ***özlərinə qaytarıb verin. Bu qadınların mehrlərini özlərinə verdiyiniz təqdirdə onlarla evlənməyinizdən sizə heç bir günah olmaz. Kafir qadınları öz kəbininiz altında saxlamayın. Həmin qadınlara verdiyiniz mehri*** *(onların ərə getdiyi kafirlərdən)* ***istəyin. Kafirlər də*** *(İslamı qəbul edib möminlərlə evlənən qadınlara)* ***sərf etdikləri mehri*** *(sizdən)* ***istəsinlər. Allahın hökmü budur. O, sizin aranızda*** *(belə)* ***hökm edər. Allah*** *(hər şeyi)* ***biləndir, hikmət sahibidir!».*** *(əl-Mumtəhinə 10).* Bu ayə nazil olduqdan sonra Ömər - *radıyallahu anhu* – iki müşrik zövcəsini boşadı və onlardan birini Muaviyə b. Əbu Sufyan - *radıyallahu anhu* –, digərini isə Səfvan b. Umeyyə aldı. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Mədinəyə gəldikdən sonra müsəlman olmuş Qureyşli Əbu Bəsir (Utbə b. Useyd əs-Səqəfi) - *radıyallahu anhu* – onun yanına gəldi. Qureyş də onu qaytarmaq üçün iki nəfər göndərdi və onlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəlib: «Bizimlə bağladığın sülh müqaviləsinə görə Əbu Bəsri - *radıyallahu anhu* – nu geri qaytarmalısan!» deyə ona müraciət etdilər. O, Əbu Bəsri - *radıyallahu anhu* – nu həmin iki kişiyə təhvil verdilər. Onlar Əbu Bəsri - *radıyallahu anhu* – ilə Məkkəyə yola düşdülər və nəhayət gəlib Zul-Huleyfə adlanan yerə çatdılar. Burada onlar (xurcunlarındakı) xurmadan yemək üçün dayandılar. Əbu Bəsri - *radıyallahu anhu* – onlardan birinə (Xuneyn b. Cabirə): «Ey filankəs, Allaha and olsun ki, sənin bu qılıncın çox gözəldir!» dedi. Qılıncın sahibi onu qınından çıxardıb dedi: «Doğrudan da bu çox gözəl qılıncdır. Mən onu bir neçə dəfə təcrübədən keçirmişəm». Əbu Bəsri: «Göstər görüm necə qılıncdır?» dedi. (Qılıncı ona göstərdikdə Əbu Bəsri) fürsət tapıb qılıncı onun əlindən aldı və nəfəsi kəsilənə qədər qılıncla onu vurdu. O, birisi isə (Xuneysin mövlası) qaçıb Mədinəyə gəldi və tələsik məscidə daxil oldu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onun vahimə içində yürüyə-yürüyə gəldiyini görüb: «Bu adam nədənsə qorxub!» deyə buyurdu. O, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəlib dedi: «Allaha and olsun ki, yoldaşım öldürüldü! (Qorumasanız) Mən də öldürüləcəyəm!». Bu vaxt Əbu Bəsri - *radıyallahu anhu* – gəlib dedi: «Ey Allahın Rəsulu! Allaha and olsun ki, artıq o, sənə vədini yerinə yetirməyə yardım etdi və sən də məni müşriklərə təhvil verdin. Sonra isə Allah məni onların əlindən xilas etdi». Peyğəmbər: «Vay bunun anasının halına! Bu müharibə alovunu qızışdıran bir kimsədir. Əgər bir neçə nəfər də onunla həmrəy olsa (o, zaman müharibə alovu qızışacaq və sülh müqaviləsi pozulacaq)». Əbu Bəsri - *radıyallahu anhu* – bunu eşitdikdə onun yenidən müşriklərə qaytarılacağını başa düşdü və Mədinədən çıxıb dənizin sahilinə tərəf getdi. Sonra müşriklərdən canını qurtarmış Əbu Cəndəl b. Suheyl - *radıyallahu anhu* – da gəlib ona qoşuldu.

Daha sonra Məkkə müşriklərindən yaxa qurtaran hər bir müsülman ona qoşuldu və beləliklə də onlar qüvvətli bir dəstəyə çevrildilər. Vallahi onlar hər dəfə Qureyşin ticarət karvanının Şama yola düşdüyündən xəbər tutduqda karvanın qabağını kəsər və onları öldürüb mallarını götürürdülər. Bu təhlükəni görən Qureyş öz tərəfindən bir nümayəndəni (Əbu Sufyan) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına göndərdilər. Bu dəfə Qureyş Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i Allaha and verib aralarında olan qohumluq əlaqələrinin hörmətinə görə (onların ticarət karvanlarını Əbu Bəsir - *radıyallahu anhu* – və onun cəmaatından qorumaq üçün) ona yalvardılar. Onlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə: «Bundan sonra müsəlman olaraq Məkkədən hicrət etmiş hər bir şəxs əmin ola bilər ki, (geri gətirilməyəcəkdir)» deyə xəbər göndərmişdilər.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabələrdən birini (bu xoş xəbəri çatdırmaq üçün) Əbu Bəsir və onun cəmaatının yanına göndərdi və Uca Allah bu ayəni nazil etdi: ***«Sizi onlara** (müşriklərə) **qalib etdikdən sonra Məkkə vadisində** (Hudeybiyyədə) **onların əlini sizdən, sizin də əlinizi onlardan çəkən** (onları sizinlə, sizi də onlarla vuruşmağa qoymayan) **Odur…» ayəsindən: «Kafirlər öz ürəklərində Cahiliyyət təkəbbürünə və təəssübünə qapıldıqları zaman…».** (əl-Fəth 24-26).* Onalrın təkəbbür və təəssübü Hudeybiyyə müqaviləsinə «Bismilləhir-Rahmənir-Rahim», «Muhəmmədən Rəsulullah» sözlərini yazmaqdan imtina etmələri və həmin ili (hicrətin 6-cı ilində) müsəlmanların Məkkəyə daxil olub Allahın evini ziyarət etməyə razılıq verməmələri idi[49].

Sələmə b. Əkva - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə Hudeybiyyəyə gəldik. O, gün bizim sayımız 1400 nəfər idi. Özümüzlə əlli qoyun da gətirmişdik. (Ora çatdıqda susuzluq bizi bürümüşdü). Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – su quyusunun kənarında oturdu. Sonra (mən bilmədim) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ya dua etdi, ya da quyunun içinə tüpürərək oradan su fəvvarə ilə vurmağa başladı. Biz (oradan gedənə qədər) doyunca su içdik, heyvanlarmıza su verdik və özümüzlə də sudan (xeyli miqdarda) götürdük. Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizləri bir ağacın altına beyət etmək üçün dəvət etdi. İnsanlar içərsində ilk olaraq mən ona beyət etdim. Sonra digərləri beyət etməyə başladılar. Nəhayət insanların (beyət edənlərin) sayı yarıya çatmışdı ki, Peyğəmbər: «Beyət et! Ey Sələmə!» Mən: «Ey Allahın Rəsulu! Mən sənə ilk beyət edənlərdən oldum!» dedim. O: «Bir daha beyət et!» deyə buyurdu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – məni silahsız görüb dəridən bəzədilmiş bir qalxanı mənə verdi və beyət etməyinə davam etdi. Nəhayət insanların (beyət edənlərin) sonuna çatdığı zaman mənə: «Sən beyət etmirsən, ey Sələmə!» deyə buyurdu. Mən: «Ey Allahın Rəsulu! Mən sənə ilk beyət edənlərdən və insanların (beyət edənlərin) yarıya çatdığı zaman yenə beyət edənlərdən oldum!» dedim. O: «Bir daha beyət et!» deyə buyurdu. Mən üçüncü dəfə beyət etdim. Sonra o, mənə buyurdu: «Ey Sələmə! Sənə verdiyim qalxan haradadır?» Mən: «Ey Allahın Rəsulu! Əmim Amiri - *radıyallahu anhu* – nu silahsız gördüyüm üçün qalxanı ona verdim» dedim. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – gülərək buyurdu: «Sənin əminlə olan bu halın əvvəlki (ümmətlərdə) yaşamış bir adamın söylədiyi kimi: «Ey Allahım! Mənə öz nəfsimdən daha çox sevdiyim bir (adamı, dostu, neməti) əta et!» sözlərini deyən şəxsə bənzəyirsən!».

Sonra müşrüklər bizim yanımıza öz nümayəndələrini göndərib sülh müqaviləsi bağlamağı təklif etdilər. Sülh müqaviləsi bağlandı. Arada gediş-gəliş bərpa olundu. Mən Təlhə b. Ubeydullah - *radıyallahu anhu* – nun xidmətçisi idim. Onun atını suvarır, daraq ilə atı təmizləyir, habelə ona digər xidmətlər göstərir və onun yeməyindən yeyirdim. Mən Allahın (rəhmini qazanmaq) və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə itaət etmək üçün ailəmi (qohum-əqrabamı) və malımı tərk edib (Mədinəyə hicrət etmişdim). Məkkə əhalisi ilə arada sülh müqaviləsi bağlanıb və gediş-gəliş bərpa olunduqdan sonra mən dincəlmək üçün bir ağacın yanına yaxınlaşdım. Ağacın altına tökülən tikanları təmizləyib orada uzandım. Bu zaman Məkkə müşriklərindən dörd nəfər mənim yanıma gəlib Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – haqqında nəlayiq sözlər deməyə başladılar. Mən onların dediklərinə qəzəblənib yerimi dəyişərək başqa ağacın altına keçib uzandım. Onlar da silahlarını ağacdan asıb orada uzanaraq yatdılar. Bu zaman vadinin aşağı tərəfindən bir carçı səsləyərək: «Gəlin ey mühacirlər! İbn Zuneym - *radıyallahu anhu* – nu öldürmüşlər!» qışqırırdı. Mən dərhal qılıncımı sıyıraraq yatmaqda olan dörd (müşrükün) üstünə hücum edərək qılınclarını aldım. Muhəmmədin üzünü mübarək edən Allaha and olsun ki, sizlərdən kim başını qaldırsa boynunu vuracağam. Sonra onları qabağıma salıb Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gətirdim. Bu arada əmim Amir (Qureyşin) Abələ qolundan olan Mikrəzi və yetmiş müşriki qabağına salıb zirehli atın üstündə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – gətirilən əsirlərə baxaraq: «Onları buraxın! Bu onlar üçün birinci və axırıncı dəfə olsun!» deyə buyurdu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onları bağışlayaraq hamısını buraxdırdı və (bu səbəbdən də) Uca Allah bu ayəni nazil etdi: ***«Sizi onlara** (müşriklərə) **qalib etdikdən sonra Məkkə vadisində** (Hudeybiyyədə) **onların əlini sizdən, sizizn də əlinizi onlardan çəkən** (onları sizinlə, sizi də onlarla vuruşmağa qoymayan) **Odur. Allah sizin nə etdiyinizi görəndir!».** (əl-Fəth 24).* Mədinəyə qayıtmaq üçün yola çıxdıq. Yolda müşrik olan Lahyan qəbiləsinə yaxın bir yerdə dayanmalı olduq. Bizimlə onların arasında bir dağ var idi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm*

[49] Buxari 2731, Müslim 1783.

– bu gecə o, dağa çıxıb müşriklər haqqında həm (düşmənin halı, sayı, həm də müsəlmanları düşmənlərin hücumundan xəbərdar etmək üçün) xəbər gətirən şəxs üçün Allahdan bağışlanma dilədi. Əbu Sələmə deyir ki: «Mən o, gecə iki və ya üç dəfə o, dağa çıxdım. Nəhayət Mədinəyə gəlib çatdıqda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in xidmətçisi Rəvahla birlikdə məni geridə qalmış minik və yük dəvələrinə baş çəkməyə göndərdi. Mən də Təlhə - *radıyallahu anhu* – nun atını götürüb Rəvahla yola düşdüm. (Atı, minik və yük dəvələri ilə bərabər suya gətirir, suvardıqdan sonra bir az otladır sonra yenə də suvarmağa gətirirdik). Səhər bir də nə görsək yaxşıdır! AbdurRahman əl-Fəzari Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in minik və yük dəvələrinə basqın etmiş, çobanı öldürərək heyvanların hamısını qabağına qatıb sürüb aparmışdı. Mən: «Ya Rəvah! Bu atı götür və dərhal onu Təlhə b. Ubeydullah - *radıyallahu anhu* – ya çatdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də xəbər ver ki, müşriklər onun heyvanlarına basqın ediblər». Sonra mən bir təpənin üstünə çıxaraq üç dəfə: «Ey sabahlayanlar! (oyananlar!) Köməyə gəlin, basqın var!» deyə səslədim. Sonra müşrikləri həm ox atəşinə tutur həm də: «***ƏNƏBNUL ƏKVA VƏL YƏVMU YƏVMUR RUDDA*** – Əkvanın oğluyam mən, alçaqların ölüm günüdür bu gün!» deyərək qısa vəznli şer söyləyirdim. Nəhayət onlardan birinə çatdım. Ona doğru ox atdım. Ox onun çiyninə batdı. Mən: «Al səni! Əkvanın oğluyam mən, alçaqların ölüm günüdür bu gün!» dedim. Allaha and osun ki, mən heç dayanmadan onları ox atəşinə tutub öldürürdüm. Mən onları ox atəşinə tutduqca onlar (çıxılmaz vəziyyətdə qalaraq) özlərini dağın dərəsinə saldılar. Dərhal dağın üstünə çıxaraq başlarına daş yağdırmağa başladım. Onları izləməkdən bir addım belə geriyə çəkilmədim. Nəhayət ələ keçirdikləri heyvanları bir-bir buraxaraq qaçmağa başladılar. Onlar (canlarını qurtarsınlar) deyə yüklərini yüngülləşdirmək üçün otuzdan çox paltar və nizə atmışdılar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – və səhabələri bilsinlər deyə onların (müşriklərin) atdıqları silahların üzərinə daşlardan işarələr qoydum. Nəhayət gəlib dar bir dağ yoluna çatdılar. Bu vaxt AbdurRahman b. Bədr əl-Fəzarinin oğlu onların yanına gəlib oturdu. Oturub səhər yeməyini yeməyə başladılar. Mən də dağın kiçik bir təpəsinin üstündə oturub onlara tamaşa etməyə başladım. Fəzari onlara: «Bu gördüklərim nədir belə?» Onlar: «Təpənin üstündəki o, adamı görürsən? Vallahi alaqaranlıqdan bizdən heç ayrılmır, dayanmadan bizi ox atəşinə tutub. Əlimizdə olan hər şeyi alıbdır». Fəzari: «Dərhal sizdən dörd nəfər onun yanına getsin!» dedi. Dörd nəfər mənə tərəf gələrək dağa çıxmağa başladılar. Onlar mənimlə danışa biləcək bir məsafəyə çatdıqda mən: «Siz məni tanıyırsınız?» deyə soruşdum. Onlar: «Xeyr! Sən kimsən?» dedilər. Mən: «Mən Sələmə b. Əkvayam. Muhəmmədin üzünü mübarək edən Allaha and olsun ki, sizdən kimi tutmaq (öldürmək) istəsəm buna nail ola bilərəm. Lakin sizlər məni tutmaq (öldürmək) istəsəniz də tutub (öldürə) bilməzsiniz». Onlardan biri: «Mən də elə bunu zənn edirəm» deyib geri qayıtdılar. Mən isə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yardım üçün gələn süvarilərini görməyənədək yerimdən tərpənmədim. Süvarilər ağacların arasından görünməyə başladılar. Süvarilərin önündə Əxrəm əl-Əsədi - *radıyallahu anhu* –, ondan arxada Əbu Qatadə əl-Ənsari - *radıyallahu anhu* –, onun da ardınca Miqdad b. əl-Əsvəd əl-Kindi - *radıyallahu anhu* – vardı. Mən (onlara yaxınlaşıb) dərhal Əxrəm - *radıyallahu anhu* – nun atının yüyənindən tutdum. Bu an həmin o, (müşriklər) qaçmağa başladılar. Əxrəm: «Axı onlar qaçırlar!» Mən: «Ya Əxrəm! Onlardan özünü qoru! Mən istəmirəm ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələri gəlincəyə qədər onlar səni öldürsünlər!» dedim. Əxrəm: «Ey Sələmə! Əgər sən Allaha və Axirət gününə iman edir və Cənnətin haqq, Cəhənnəmin haqq olduğuna inanırsansa Onun yolunda şəhid olmağıma mane olma!» dedi. Mən də ona heç bir söz deməyib onu sərbəst buraxdım. Əxrəm - *radıyallahu anhu* – ilə əl-Fəzari bir-biri ilə tək-bətək qarşılaşdılar. Əxrəm - *radıyallahu anhu* – əl-Fəzarinin qarşısında atını dayandırdı. əl-Fəzari nizə ilə onu vurub öldürdü və dərhal atının üstünə minərək qaçdı. Əbu Qatadə - *radıyallahu anhu* – və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in süvariləri ona çataraq nizə ilə vurub onu öldürdülər. Muhəmmədin üzünü mübarək edən Allaha and olsun ki, onların ardınca qaçır və onları təqib edirdim. Nəhayət arxamda nə Muhəmmədin səhabələrindən, nə də onların (atlarının yürüməsindən çıxan) tozlarından heç bir şey görmürdüm. Müşriklər günəş batmamışdan əvvəl Zu-Qarad adlanan su vadisinə gəlib çatdılar. Onlar susamış bir halda idilər. Onlar mənim (onların) ardınca gəldiyimi bilib bir qurtum su belə içmədən oranı tərk etdilər. Qaçaraq təpənin üstünə çıxmağa başladılar. Mən də onların ardınca qaçaraq birinə yaxınlaşaraq ox atdım. Ox (müşrikin) arxa tərəfdən çiyin nahiyəsinə batdı və mən: «Al səni! Əkvanın oğluyam mən, alçaqların ölüm günüdür bu gün!» dedim. O (müşrik): «Anası onu itirsin! Sən alaqaranlıqdan şer oxuyan Əkvasan?» dedi. Mən: «Bəli, ey nəfsinin düşməni! Mən alaqaranlıqdan (sizi izləyən) Əkvayam!» dedim. Onlar dağın təpəsində iki atı tərk edərək getdilər. Mən də o, iki atı sürüb Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gətirdim. Yolda Amir - *radıyallahu anhu* – məni bir əlində bir az süd, digər əlində isə su olan iki tuluq ilə qarşıladı. Mən su ilə dəstəmaz aldım, süddən də içdim. Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldim. O, müşriklərin tərk etdikləri suyun kənarında dayanmış və onlardan aldığım dəvələri, paltarları və nizələri götürmüşdü. Bilal - *radıyallahu anhu* – isə dəvələrdən birini kəsib ciyəri ilə hürgücündən (dəvənin belindəki təpəcik) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – üçün qızardırdı. Mən: «Ya Rəsulullah! Mənə izn ver yüz nəfər seçib götürüb o, (müşriklərin) ardınca gedib hamısını qırım. Bu sözlərə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – gündüzün parlaqlığında yan dişləri görünənə qədər güldü və: «Ey Sələmə! Əgər sənə izn versəm bu işi edəbiləcəksənmi?» deyə buyurdu. Mən: «Səni hörmətli edən Allaha and olsun ki, edə bilərəm!» dedim. Peyğəmbər: «Hal hazırda onlar Ğatafan

ərazisində ziyafətdə qonaqdırlar. Ğatafan ərazisindən bir nəfər gəlib dedi: «Filan kimsə onlar üçün dəvə kəsdi. Onlar dəvənin dərisini soyarkən bir toz gördülər. Oradakılar: «Sizi qovalayanlar gəlirlər!» deyərək qaçıb getdilər. Səhəri Peyğəmbər: «Bu gün süvarilərimizin ən xeyirlisi Əbu Qatadə, piyadalarımızın ən xeyirlisi isə Əbu Sələmədir!» deyə buyurdu. Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bir süvari hissəsindən bir də piyada hissəsindən iki hissə (qənimətdən) ayıraraq mənə verdi. Sonra Mədinəyə qayıdarkən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – məni Adba adlı dəvəsinin arxasına mindirdi. Biz bu şəkildə yollandıq. Yolda Ənsarlardan biri: «Mədinəyə qədər qaçaraq yarışmaq istəyən varmı?» deyərək sözünü bir neçə dəfə təkrar etdirdi. Mən onun bu sözlərini eşidcək: «Məgər sən alicənab, möhtərəm insanlara hörmət etmirsən?» dedim. O: «Xeyr! Mən yalnız Allahın Rəsuluna hörmət edirəm!» dedi. Mən: «Ya Rəsulullah! Atam anam sənə fəda olsun! Mənə izn ver o, adamla yarışım!» dedim. Peyğəmbər: «İstəyirsənsə yarış!» deyə buyurdu. Mən (üzümü yarışmaq istəyən o, adama tutaraq): «Sən qaç!» dedim. Mən ayaqlarımı qaçış üçün büküb onun ardınca sıçrayaraq qaçmağa başladım. Ona qarşı bir və ya iki yerdə nəfəsimi almaq üçün dayandım. Sonra yenə də onun ardınca sürətlə qaçmağa başladım. Sonra yenə də bir və ya iki yerdə nəfəsim kəsilməsin deyə dayandım. Sonra yenə də ona çatmaq üçün ardınca qaçdım. Nəhayət gəlib ona çatdıqda çiyninə vuraraq: «Vallahi mən səni ötdüm!» dedim. O: «Mən də hesab edirəm ki, sən məni ötdün!» dedi. Beləliklə Mədinəyə qədər yarışdıq və mən onu arxada qoydum. Sələmə: Allaha and olsun ki, biz bu Zu-Qarad səfərindən qayıtdıqdan sonra Mədinədə üç gün dincəldikdən sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə Xeybər istiqamətində yola çıxdıq. Əmim Amir - *radıyallahu anhu* – qısa vəznlə şerlər deyirdi:

**TƏLLAHİ! LƏVLALLAHU MƏHTƏDƏYNƏ**
**VƏ LƏ TƏSADDƏQNƏ VƏ LƏ SALLƏYNƏ**
**VƏNƏHNU AN FƏDLİKƏ MƏSTƏĞNƏYNƏ**
**FƏSƏBBİTİL ƏQDƏMƏ İN LƏQƏYNƏ**
**VƏ ƏNZİLƏN SƏKİNƏTƏN ALEYNƏ**

Allaha and olsun ki, Allah istəməsəydi hidayət olunmazdıq biz,
Nə sədəqə verərdik, nə də namaz qılardıq biz,
Olmasaydı lütfün sənin, keçinə bilməzdik biz,
Sabit et qədəhlərmizi, düşmənlə qarşılaşdıqda biz,
Sakitlik (mənəvi bir qüvvət) nazil et Sən bizə!

Peyğəmbər: «Bu kimdir?» deyə buyurdu. Amir: «Mənəm Amir!» dedi. Peyğəmbər: «Allah sənə məğfirət etsin!» deyə dua etdi. Belə bir şey vardı ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – kimin üçün Allahdan xüsusən məğfirət diləyirdisə o, şəxs mütləq şəhid olurdu. Bu vaxt dəvə üstündə əyləşmiş Ömər b. əl-Xəttab - *radıyallahu anhu* – dedi: «Ey Allahın Rəsulu! İzn ver Amir oxusun və bizi feyziyab etsin!». Biz Xeybərə çatdıqda düşmənlərin başçısı Mərhəb qılınc oynadaraq irəli çıxdı və:

**QAD ALİMƏT XEYBƏRU ƏNNİ MƏRHƏB**
**ŞƏKİSSİLƏHİ BƏTALUN MUCƏRRABU**
**İZƏL HURUBU ƏQBƏLƏT TƏLƏHHƏBU**

Artıq Xeybər tanıdı, bildi ki, Mərhəbəm mən!
Müharibə başlayıb, döyüş alovlanarkən,
Mahir silah ustası, təcrübəli ərəm mən!

Əmim Amir - *radıyallahu anhu* – onunla təkbətək döyüşmək üçün irəli çıxdı və:

**QAD ALİMƏT XEYBƏRU ƏNNİ AMİRU**
**ŞƏKİSSİLƏHİ BƏTALUN MUĞAMİRU**

Artıq Xeybər tanıdı, bildi ki, Amirəm mən,
Mahir silah ustası, çevik qəhrəmanam mən!

Təkbətək döyüş başladı və hər ikisi bir-birinə qılınc ilə zərbələr endirməyə başladılar. Mərhəbin qılıncı Amirin qalxanına dəydi. Amir də onu alt nahiyədən vurduqda qılıncı özünə qayıdaraq qolunun damarını kəsdi. Amirin ölümü də bu yaradan oldu. Mən gördüm ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələrindən bir neçəsi: «Amirin cihad əməli batil oldu, o özü-özünü öldürdü!» deyə danışırdılar. Mən ağlayaraq Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldim və: «Ey Allahın Rəsulu! Amirin cihad əməli batil olub boşa getdimi?» deyə soruşdum. Peyğəmbər: «Bunu kim iddia edir?» deyə buyurdu. Mən: «Səhabələrdən bəziləri» dedim. O: «Bunu söyləyən yalan demişdir! Əksinə o, ikiqat savab qazanmışdır!» deyə buyurdu. Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – məni Əli - *radıyallahu anhu* – nu çağırmağa göndərdi. Əli - *radıyallahu anhu* – gözlərinin ağrısından əziyyət çəkirdi. Peyğəmbər: «Bu bayrağı (sabah) elə bir kimsəyə verəcəyəm ki, o Allahı və Rəsulunu sevir, Allah və Rəsulu da onu sevir!» deyə buyurdu. Mən Əli - *radıyallahu anhu* – nun yanına gəldim. Gözləri ağrıdığı üçün onun əlindən tutub Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gətirdim. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əli - *radıyallahu anhu* – nun gözlərinə tüpürərək dua etdi və onun gözləri dərhal sağaldı. Bayrağı ona verdi. Yəhudi Mərhəb irəli çıxaraq:

**QAD ALİMƏT XEYBƏRU ƏNNİ MƏRHƏB**
**ŞƏKİSSİLƏHİ BƏTALUN MUCƏRRABU**
**İZƏL HURUBU ƏQBƏLƏT TƏLƏHHƏBU**
Artıq Xeybər tanıdı, bildi ki, Mərhəbəm mən!
Müharibə başlayıb döyüş alovlanarkən,
Mahir silah ustası, təcrübəli ərəm mən.

Onun sözlərinə cavab olaraq Əli - *radıyallahu anhu* – dedi:
**ƏNNƏLLƏZİ SƏMMƏTNİ UMMİ HƏYDƏRAH**
**KƏLƏYSİ ĞABƏTİN KƏRİHİL MƏNZARAH**
**UFHİMU BİSSAİ KƏYLƏSSƏNDƏRAH**
Anamın Heydər (aslan) adlandırdığı mənəm,
Meşələr aslanı tək zəhimli görkəmliyəm,
Düşmənləri pərən-pərən edib tez öldürərəm!

Şeri oxuyaraq döyüşə atıldı və Mərhəbin başından qılınc ilə vuraraq onu öldürdü. Bundan sonra Xeybər məhz Əli - *radıyallahu anhu* – nun iki əli ilə alındı[50]. (Başqa rəvayətdə: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əli - *radıyallahu anhu* – nun gözlərini müalicə etdikdən sonra Əli: «Ya Rəsulullah! Xeybər Yəhuduləri ilə onlar da bizim kimi (müsəlman) olana qədər vuruşacağam» dedi. Peyğəmbər: «(Ey Əli!) Onların sahəsinə girdiyin zaman yavaş-yavaş yeri. Sonra onları İslama dəvət et və üzərilərinə vacib olan İslam əsaslarını onlara xəbər ver. Allaha and olsun ki, (ya Əli!) tək bir nəfəri sənin səbəbinlə Allah hidayətə yönəldərsə bu sənin üçün qırmızı dəvələrdən də xeyirli olar!» deyə buyurdu[51].

## SƏKKİZİNCİ HƏDİS

**(AİŞƏ** *– radyallahu anhə –*: **«YALAN, BÖHTAN CƏHƏNNƏMƏ APARAN YOLDUR»)**

***«O, kəslər ki, yalan yerə şahidlik etməz, faydasız bir şeylə rastlaşdıqları*** *(lağlağı bir söhbət eşitdikləri)* ***zaman onlardan üz çevirib keçər*** *(özünü ləyaqətlə aparıb onlara əhəmiyyət verməz)****»****. (əl-Furqan 72).* ***«O, kəslər ki, lağlağıdan, lüzumsuz şeylərdən üz döndərərlər».*** *(əl-Muminun 3).* ***«Zinadan xəbəri olmayan namuslu, ismətli mömin qadınları zinada ittiham edənlər dünyada və axirətdə lənətə düçar olarlar. Onları*** *(Qiyamət günü)* ***çox böyük bir əzab gözləyir».*** *(ən-Nur 23).* ***«Mömin kişi və qadınları etmədikləri bir işdən*** *(günahdan)* ***ötrü incidənlər, şübhəsiz ki, öz üzərlərinə böhtan və açıq-aydın bir günah götürmüşlər».*** *(əl-Əhzab 58).* ***«İsmətli qadınlara zina isnad edib, sonra*** *(dediklərini təsdiqləyəcək)* ***dörd şahid gətirə bilməyən şəxslərə səksən çubuq vurun və onların şəhadətini heç vaxt qəbul etməyin. Onlar sözsüz ki,*** *(Allahın itaətindən çıxmış)* ***əsil fasiqlərdir».*** *(ən-Nur 4).*

Aişə – *radyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – bir səfərə çıxmaq istədikdə zövcələri (yoldaşları) arasında püşk atardı. Püşk onlardan hansına düşsəydi Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – onu özü ilə birlikdə səfərə aparardı. Döyüşlərin birinə getmək istədiyi vaxt həmişəki kimi aramızda püşk atdı və bu dəfə püşkdə mənim adım çıxdı. Mən Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – ilə birlikdə səfərə çıxdım. Bu səfərimiz artıq hicab ayəsinin nazil olmasından sonra baş vermişdi. Məni Kəcavəndin içərisində aparırdılar. (Dincəlmək istədikdə) kəcavəndin içərisindən düşərdim. Bütün səfər boyu belə davam etdi. Nəhayət Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – bu döyüşü başa vurub Mədinəyə yaxınlaşdıqda (dincəlmək üçün) dayandı. (Bir müddət orada qaldıqdan sonra) Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – hərəkət etmək əmrini verdi. Mən (ehtiyacımı ödəmək üçün təkbaşına) ordudan ayrılmışdım. Ehtiyacımı yerinə yetirib geri qayıtdım. (Yolda əlimi) sinəmə vurduqda gördüm ki, Yəmən muncuqlarından olan boyunbağım qırılıb düşmüşdür. Dərhal dönüb onu axtarmağa başladım. Elə onu axtarmaq da məni yoldan saxladı. Mənim kəcavəndimi aparan kimsələr mənim orada olduğumu zənn edərək kəcavəndi dəvənin üstünə qoymuşdular. O, zaman qadınlar xəfif və az yedikləri üçün yüngül çəkili olurdular. Elə bu səbəbdən də kəcavəndi qaldıran kimsələr onun çəkisindəki fərqə varmayaraq onu (dəvənin üzərinə) qoymuşdular. O, vaxt mən kiçik yaşda (gənc yaşında) bir qadın idim. Bu səbəblə də dəvəni qaldırıb və çəkib getmişdilər. Ordu getdikdən sonra mən boyunbağımı tapdım. Mən ordunun olduğu yerə gəldikdə artıq orada nə bir çağıran, nə də bir cavab verən vardı. Kəcavəndin qoyulduğu yerə gəldim. Onlar məni kəcavəndin içərisində tapmadıqlarını bilib geri dönəcəklərini güman etdim. Mən bu fikirlə yerimdə oturdum. (Bir müddətdən sonra) gözlərim mənə üstün gəlib yatdım (yuxuladım).

---

[50] Müslim 1807.
[51] Buxari «Xeybər döyüşü babı», Müslim 2406.

Səfvan b. Muattil əs-Suləmi sonra Zəkvani[52] arxadan gələn əsgərlərin qalmış olan əşyalarını və s. şeyləri götürərək (toplayaraq) sahibinə qaytarmaq vəzifəsinə sahib idi. Bu kimsə səhərə yaxın mən olduğum yerə gəlib çatdıqda yatmış bir insan qaraltısını görüb mənə yaxınlaşmışdı. O, (hicab ayəsi) nazil olmamışdan əvvəl məni gördüyü üçün dərhal məni tanımışdı. Mən onun (məni tanıdığı an) ***/İNNƏ LİLLƏHİ VƏ İNNƏ İLEYHİ RACİUN – Biz Allahın bəndələriyik və ona tərəf qayıdacağıq».*** *(əl-Bəqərə 156)* ayəsini «İstirca» sözlərini söyləməsi ilə ayıldım. Dərhal çarşabla üzümü örtdüm. Allaha and olsun ki, bir tək kəlmə də belə demədi və mən ondan «İstirca» sözlərindən başqa bir kəlmə də belə eşitmədim. Mənim dəvəyə minməyim üçün dəvənin ön ayaqlarını basaraq (dəvəni) çökdürdü. Mən dəvəyə mindim. (Dəvənin üzəngisindən) tutaraq çəkib apardı. Nəhayət şiddətli isti olduğundan dincəlmək üçün dayanmış orduya çatdıq. Bu an haqqımda (iftira olaraq) həlak olan həlak olmuşdur. İftira atan Abdullah b. Ubeyy b. Səlul idi. Nəhayət Mədinəyə çatdıq.

Mədinəyə gəldikdə bir ay xəstə oldum. Bu vaxt camaat iftira söhbətlərini (sözlərini) danışır və müzakirə edirdilər. Mən isə bunların heç birindən xəbərdar deyildim. Yalnız xəstələndiyim zaman məni şübhələndirən bir şey vardı ki, o da Peyğəmbər - *səllallahu aleyhi və səlləm –* dən başqa vaxtlarda görməkdə olduğum Lütf və Mərhəməti bu xəstəliyim vaxtı görmürdüm. Ancaq yanıma gəldikdə salam verər, sonra da (adımı çəkmədən): «Xəstəniz necədir!» deyə buyurardı. Bütün bunlar məni şübhələndirsə də mən şərri hiss etmirdim. Nəhayət xəstəliyimdən təzə qurtarmışdım ki, (sağalmışdım) evdən çölə çıxdım. Mənimlə bərabər Mistahın anası (Ummu Mistah) da çıxmışdı. Biz ehtiyacımızı ödəmək üçün Mənasi[53] tərəfə çıxmışdıq. Buralar ancaq gecədən-gecəyə zəruri ehtiyacımızı ödəmək üçün çıxdığımız yerlər idi. Bu da evlərimizin yaxınlıqlarında ayaqyolları tikilənə qədər davam etdi. O, vaxtlar bizim bu halımız ibtidai ərəblərin halına bənzəyirdi (onlar da zəruri ehtiyaclarını ödəmək üçün evlərindən çox uzaqlaşardılar). Mən də Mistahın anası ilə çölə çıxdım. Bu qadın Əbu Ruhm b. Muttalib b. Abdi Mənafın qızıdır. Anası da Səxr b. Amirin qızıdır ki, bu qadın da Əbu Bəkr əs-Sıddıqın xalasıdır. Əbu Ruhmın qızının oğlu da Mistah b. Usasə b. Abbad b. Muttalibdir. Birgə evə qayıtdıqda Mistahın anasının paltarının (ətəyi) ayağına ilişərək sürüşdü. (Ərəblər arasında fəlakət zamanı söylənilməsi adət olan: «Düşmənin həlak olsun! duası yerinə): «Mistah həlak olsun! deyə oğluna bəd dua etdi. Mən də ona: «Nə pis söz söylədin! Bədr döyüşündə döyüşən bir kimsəni söyürsən?» dedim. Qadın mənə: «Eh! Sən onun söylədikləri sözləri hələ eşitməmisən?» deyə cavab verdi. Mən: «O, nə deyib ki!» deyə soruşdum. O, da mənə iftira sahiblərinin dedikləri sözləri xəbər verdi. Artıq xəstəliyimin üstünə bir xəstəlik də əlavə olundu. Evə qayıtdıqda yanıma Peyğəmbər - *səllallahu aleyhi və səlləm –* gəldi. İçəri daxil olaraq salam verdi və: «Xəstəniz necədir?» deyə buyurdu. Mən də valideyinlərimin yanına getmək üçün ondan izn istədim. Niyyətim (mənim haqqımda gəzən) bu xəbərin doğru olub-olmadığını valideyinlərimdən dəqiqləşdirmək idi. Peyğəmbər - *səllallahu aleyhi və səlləm –* mənə izn verdi. Mən də valideyinlərimin yanına gələrək anama: «Anacan! İnsanlar nə danışırlar?» deyə soruşdum. Anam: «Qızım! Özünü üzmə. Özünü və səhhətini fikirləş. Vallahi bir kişinin yanında sevdiyi gözəl bir qadını olsun və onun bir çox ortaqları olsun və onun əleyhinə danışmasınlar bu çox nadir hallarda (olan bir hadisədir)» deyə cavab verdi. Mən: «Subhənəllah! İnsanlar bunu mu danışırlar?» dedim. Bunun üzərinə bütün gecəni ağladım. Səhərə qədər gözümün yaşı dayanmırdı. Səhərə kimi bir anlıq belə yuxuya gedə bilmədim. Ağlamaqla səhəri açdım. Peyğəmbər - *sallallahu aleyhi və səlləm –* vəhyin nazil olması gecikdiyi üçün Əli b. Əbu Talib və Usamə b. Zeyd – *radyallahu anhum –* yanına çağırdı. Onlardan zövcəsindən ayrılıb-ayrılmamaq haqqında məsləhət aldı. Usamə b. Zeydi – *radyallahu anhu –* Peyğəmbər - *sallallahu aleyhi və səlləm –* in ailəsini yaxından tanıdığı və qəlbində onlara bəslədiyi sevgiyə görə: «Ya Rəsulullah! Onlar sənin əhlindir. Biz onun haqqında xeyirdən başqa bir şey bilmirik» dedi. Əli b. Əbu Talib – *radyallahu anhu –* ya gəlincə isə o: «Allah sənə heç bir hədd qoymamışdır (dünyanı sənə dar etməmişdir). Ondan başqa nə çox qadınlar. Aişə – *radyallahu anhə –* nin xidmətçisi Bərirə – *radyallahu anhə –* dən soruşsan o, da sənə düzünü deyəcəkdir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm –* Bərirə – *radyallahu anhə –* ni yanına çağırıb buyurdu: «Ey Bərirə! Aişədə səni şübhələndirən bir hal gördünmü?» Bərirə: «Səni haqq ilə göndərən Allaha and olsun ki, ondan heç bir qəbahətli iş görmədim. Əgər görsəydim onu qınayardım. Yalnız bir şeyi demək istəyirəm ki, az yaşlı təzə bir qadındır. Ailəsinin xəmirini yoğurarkən (xəmiri) qorumağı ona tapşırırdım. O, da yatdığı üçün qoyun gəlib xəmiri yeyərdi. Bundan sonra Peyğəmbər - *sallallahu aleyhi və səlləm –* minbərə çıxıb iftiranı ortaya atan Abdullah b. Ubeyy b. Səlul üzr istəsin deyə camaata xitab edərək buyurdu: «Ey müsəlman camaatı! Sizlərdən kim mənim əhlimə əziyyət verən kimsənin ittihamını rədd edərək əhlimə bəraət qazandıra bilər? Vallahi mən öz əhlim (yoldaşım) haqqında xeyirdən başqa bir şey bilmirəm. Bu iftiraçılar bir adamın adını da ortaya çıxardıblar ki, (Səfvan b. Muattıl) bu kimsə haqqında mən xeyirdən başqa bir şey bilmirəm. Bu adı çəkilən fəzilətli insan bu ana qədər mənimlə bərabər olmaq müstəsna mənsiz ailəmin yanına girməmişdir». Bu vaxt ənsarlardan Əus qəbiləsindən olan Sad b. Muaz – *radyallahu anhu –* ayağa qalxaraq: «Ya Rəsulullah! O, kimsəyə qarşı mən sənə kömək edəcəyəm (haqq qazandıracağam). Əgər bu iftiranı çıxaran Əus qəbiləsindəndirsə biz onun boynunu vurarıq. Yox əgər (qardaşlarımız) olan Xazrac

---

[52] ***ZƏKVANDA –*** yaşadığı üçün bu ad verilmişdir. Səfvan – *radyallahu anhu* – Ömər – *radyallahu anhu* – nun xəlifəliyi dövründə hicrətin on yeddinci ilində Ermənistanı fəth edərkən şəhid olmuşdur.

[53] Mədinə yaxınlığında yerin adıdır.

qəbiləsindəndirsə bizə əmr et biz də əmrini yerinə yetirək. Bu dəfə Sad b. Ubadə ayağa qalxdı. O, da Xazrac qəbiləsinin başçısı idi. Əvvəl əməlisaleh olmuş sonra isə yolunu azmışdı. Sad b. Muaza qarşı: «Sən yalan söylədin! Allaha and olsun ki, sən nə onu öldürənsən, nə də öldürməyə qadirsən!» dedi. Bu dəfə Sad b. Muaz – *radyallahu anhu* – nun əmisi oğlu olan Useyd b. Xudeyr – *radyallahu anhu* – ayağa qalxaraq Sad b. Ubadəyə qarşı: «Allaha and olsun ki, sən yalan danışırsan! Vallahi biz onu əlbətdə ki, öldürərik. Həqiqətən sən münafiqsən ki, münafiqlərin tərəfini saxlayaraq bizimlə münaqişə edirsən. Beləliklə Əus və Xazrac qəbilələri arasında elə bir münaqişə düşdü ki, az qala bir-birlərini öldürəcəkdilər. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – minbərdən enərək onları sakitləşdirdi.

Aişə: «Mən daha bir gün də ağladım. Gözümün yaşı dayanmırdı və bir an belə yuxuya gedə bilmirdim. Valideyinlərim mənim bu cür ağlamağımı görüncə elə zənn etdilər ki, ciyərimi parça-parça edəcəyəm. Onlar mənim yanımda olduqları vaxt ənsarlardan bir qadın mənim yanıma daxil olmaq üçün izn istədi. Mən də ona izn verdim. Gəlib mənimlə birlikdə (dərdimə şərik olaraq) ağlamağa başladı. Bu vaxt Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – içəri daxil olub salam verdi və əyləşdi. Halbuki Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bundan əvvəl haqqımda iftiralar başlanan müddətdən bəri yanımda oturmamışdı. Bir ay keçməsinə baxmayaraq haqqımda heç bir şey vəhy olunmamışdı. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – əyləşib Allaha həmd-sənalar etdikdən sonra buyurdu: «Ey Aişə! Haqqında mənə filan-filan sözlər çatıbdır. Əgər sən onların dediklərin-dən uzaqsansa tezliklə Allah səni təmizə çıxardacaqdır. Yox, əgər belə bir haram işi etmisənsə Allahdan bağışlanma dilə və Allaha tövbə et. Çünki qul günahını etiraf edib Allaha tövbə etdikdə Allah da onun tövbəsini qəbul edib onu bağışlayar. Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – bu sözlərini deyib qurtardıqdan sonra gözümün yaşı kəsildi. Gözümdən bir damla da belə yaş axmadı. Mən atama: «Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in söylədiyi bu sözlərə mənim tərəfimdən cavab ver!» dedim. Atam: «Vallahi Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə nə deyəcəyimi bilmirəm!» dedi. Sonra anama: «Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – in söylədiyi bu sözlərə mənim tərəfimdən cavab ver!» dedim. Anam: «Vallahi Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə nə deyəcəyimi bilmirəm!» dedi. Mən az yaşlı uşaq olduğum üçün Qurandan da çox dəlil-sübut bilmirdim: «Vallahi mən qəti olaraq bildim ki, siz bu iftiraçıların (dedi-qodularını) eşitmisiniz. Hətta bu sözlər sizin qəlblərinizdə yer almış və ona inanmısınız. Əgər mən sizə bu günahdan uzaq olduğumu desəm, Allah da bilir ki, mən bu günahdan uzağam (günahsızam), lakin siz mənə inanmayacaqsınız. Yox, əgər günahkar olduğumu etiraf etsəm yenə də Allah bilir ki, mən bu günahdan uzağam, lakin siz bunu dərhal təsdiq edəcəksiniz. Vallahi mən bu vəziyyətdə özüm üçün və sizin üçün bu ayədən başqa bir məsəl bilmirəm. Ancaq Yusif – *əleyhissəlam* – ın atası Yəqub – *əleyhissəlam* – a dediyi sözlər kimi: **«*Mənə yalnız tükənməz, dözümlü səbr gərəkdir.*** *(Yusif barəsində)* ***dediklərinizin yalan olduğunu*** *(sübut etməyə isə)* ***ancaq Allahdan kömək diləmək lazımdır».*** *(Yusif 18)»* belə cavab verdim. Bu sözləri söyləyib yatağıma gedib yatdım. Vallahi o, zaman mən inanırdım ki, Allah mənim günahsız olduğumu üzə çıxaracaqdır. Lakin vallahi haqqımda (Qiyamətə qədər) oxunacaq bir vəhy endiriləcəyini heç zənn etmirdim. Lakin Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yuxusunda bir yuxu görməsini və Allahın da o, yuxu ilə mənə bəraət qazandıracağını ümüd edirdim. Vallahi Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – otur-duğu yerdən qalxmamışdı. Ev əhlindən də heç kimsə çölə çıxmamışdı. ***ƏZİZ*** və ***CƏLİL*** olan Allah Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə vəhy nazil etdi. Ona vəhy nazil olduğu zaman həmişə düşdüyü bir vəziyyətə düşdü. Endirilən sözün ağırlığından soyuq qış günündə də belə ondan mirvari dənələri kimi tər axırdı. Vəhy nazil olduqdan sonra Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – sevincindən gülürdü. Dediyi ilk söz isə bu oldu: «Müjdə ya Aişə! Allah səni təmizə çıxartdı!». Bu an anam mənə: «Qızım Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə doğru çıx və ona təşəkkür et!» dedi. Mən: «Vallahi nə ona tərəf çıxaram, nə də Allahdan başqasına həmd edərəm!» dedim. Uca Allah on ayə nazil etdi: ***«Həqiqətən*** *(Aişə)* ***barəsində yalan xəbər gətirənlər öz içərinizdə olan bir zümrədir*** *(münafiqlərdir)****. Onu*** *(o, xəbəri)* ***pis bir şey zənn etməyin. O, bəlkə də, sizin üçün xeyirlidir. O, zümrədən olan hər bir şəxsin qazandığı günahın cəzası vardır. Onlardan günahın böyüyünü öz üstünə götürəni*** *(Abdullah b. Ubeyy)* ***isə*** *(qiyamət günü)* ***çox şiddətli bir əzab gözləyir. Məgər o, yalan sözü eşitdiyiniz zaman mömin kişilər və qadınlar öz ürəklərində yaxşı fikirdə olub: «Bu açıq-aydın bir böhtandır!» deməli deyildilərmi.*** *(Aişəyə)* ***iftira yaxanlar nə üçün özlərinin doğru yolda olduqlarını təsdiq edəcək dörd şahid gətirmədilər? Madəm ki, şahid gətirmədilər, deməli onlar Allah yanında əsl yalançıdırlar. Əgər Allahın dünyada və axirətdə sizə neməti və mərhəməti olmasaydı o, yalan sözünüzə görə sizə şiddətli bir əzab toxunardı. O, zaman ki, siz*** *(münafiqlərin yaydığı)* ***yalanı dilinizə gətirir, bilmədiyiniz sözü ağzınıza alır və ona yüngül, asan*** *(insana günah gətirməyən)* ***bir şey sanırdınız. Halbuki bu Allah yanında çox böyük günahdır. Məgər siz onu eşitdiyiniz zaman: «Bizə bunu*** *(bu yalanı)* ***danışmaq yaraşmaz. Aman Allah! Bu çox böyük bir böhtandır!» deməli deyildinizmi. Allah sizə öyüd-nəsihət verir ki, əgər möminsinizsə bir daha belə şeyləri etməyəsiniz. Allah sizin üçün ayələrini*** *(belə ətraflı, açıq-aydın)* ***izah edir. Allah*** *(hər şeyi)* ***biləndir və hikmət sahibidir. Möminlər arasında pis söz yaymaq istəyənləri dünyada və axirətdə şiddətli bir əzab gözləyir.*** *(Hamının əməlini, yayılan şayiələrin, atılan böhtanların doğru olub olmadığını)* ***ancaq Allah bilir, siz bilməzsiniz! Əgər Allahın sizə neməti və mərhəməti olmasaydı, Allah şəfqətli və mərhəmətli olmasaydı*** *(halınız necə olardı? Dediyiniz yalanlara, yaxdığınız iftiralara görə sizi dərhal məhv edərdi)****. Ey iman***

***gətirənlər! Şeytanın yolunu tutub getməyin! Kim şeytanın getdiyi yolla getsə, o*** *(insanlara)* ***çirkin, pis işləri görməyi*** *(zina etməyi, yalan danışmağı, özgələrə böhtan atmağı)* ***əmr edir. Əgər Allahın sizə neməti və mərhəməti olmasaydı, heç kəs heç vaxt*** *(günahdan)* ***pak olmazdı. Lakin Allah dilədiyini*** *(günahdan)* ***pak edər. Allah*** *(hər şeyi)* ***eşidən və biləndir».*** *(ən-Nur 11-21).*

Allah mənim bəraətim haqqında ayələr nazil etdikdən sonra qohumluq əlaqələrinin hörmətinə və Mistah b. Usasənin kasıb bir (səhabə) olduğundan öz malından onun üçün xərcləyən Əbu Bəkr əs-Sıddıq – *radyallahu anhu* – dedi: «Qızım Aişə – *radyallahu anhə* – haqqında söylədiyi iftiralara görə mən ona malımdan heç bir şey verməyəcəyəm. (Bu sözlərdən sonra) Allah ayə nazil etdi: ***«Aranızda olan fəzilət və sərvət sahibləri qohum-əqrabaya, miskinlərə və Allah yolunda hicrət edənlərə*** *(heç bir şey verməyəcəkləri, heç bir kömək göstərməyəcəkləri barədə)* ***and içməsinlər.*** *(Onları)* ***əfv edib*** *(cəzalandırmaqdan)* ***vaz keçsinlər! Məgər siz*** *(bu yaxşılıq müqabilində)* ***Allahın sizi*** *(günahlarnızı)* ***bağışlamağını istəmirsiniz? Allah*** *(bəndələrini)* ***bağışlayan və rəhm edəndir!»*** *(ən-Nur 22).*

Hibban b. Musa dedi ki, Abdullah b. Mubarak: «Bu Allahın kitabında ən ümüdlü ayələrdir!» dedi. Bu ayənin nazil olması ilə Əbu Bəkr: «Vallahi mən Allahın məni bağışlamasını ümüd edirəm və Mistaha verdiyim malı təkrar ona verməyə başladım. Və ondan heç vaxt malımı əsirgəməyəcəyəm!» dedi.

Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – zövcəsi (yoldaşı) Zeynəb b. Cəhş – *radyallahu anhə* – dən də mənim haqqımda: «Ya Zeynəb! Aişə haqqında nə bilirsən və nə görmüsən!» deyə buyurdu. Zeynəb: «Ya Rəsulullah! Mən qulağımı, gözümü eşitmədiyim və görmədiyim şeydən mühafizə edirəm. Vallahi Aişə haqqında xeyirdən başqa bir şey bilmirəm» deyə şəhadət etmişdi. Bu o, Zeynəb idi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in zövcələri arasında gözəlliyi və Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanında olan mövqeyi ilə mənimlə rəqabət aparırdı. Lakin Allah onu təqvası səbəbilə (fitnəyə düşməkdən) qorumuşdur. Bacısı Həmnə b. Cəhş isə mənə qarşı iftiraçılara qoşularaq böhtanları yaymağa başladı və bu səbəblə də həlak olanlar içərisində həlak oldu[54].

## DOQQUZUNCU HƏDİS

### (KƏB B. MƏLİK – *radıyallahu anhu* – : «DOĞRULUQ CƏNNƏTƏ APARAN YOLDUR»)

***«Ey iman gətirənlər! Allahdan qorxun və*** *(imanında, sözündə, işində)* ***doğru olanlarla olun!»*** *(ət-Tövbə 119).* ***«Həqiqətən Allah… doğru-danışan kişilər və qadınlar…üçün*** *(axirətdə)* ***məğfirət*** *(bağışlanma)* ***və böyük bir mükafat*** *(Cənnət)* ***hazırlamışdır!»*** *(əl-Əhzab 35).*

İbn Şihab deyir ki, mənə Abdullah b. Kəb – *radıyallahu anhu* – xəbər verdi ki, atası (yəni Kəb b. Məlik) kor olduğu zaman onun oğulları içərisində Kəb b. Məlik – *radıyallahu anhu* – nun həyatda köməkçisi (yəni bələdçisi) o, olmuşdur və o, atasının ona danışmış olduğu Təbuk döyüşü ərəfəsində baş vermiş hadisəni belə xatırlayır.

Kəb: «Mən bu ana qədər Təbuk döyüşündən başqa Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in iştirak etdiyi döyüşlərin birindən də geri qalmamışdım[55]. Həmçinin Bədr döyüşündə də iştirak etməmişəm[56]. Lakin bu döyüşdən geri qalan (iştirak etməyən) heç kimsə bu döyüşdə iştirak etmədiyinə görə qınanılmamışdı. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - və müsəlmanların bu səfərə çıxmaqlarının səbəbi (Şamdan gələn) Qureyşin karvanını ələ keçirmək idi. Lakin Allah – *subhənəhu və təalə* – müsəlmanlarla düşmənlərini bir-biri ilə qarşılaşdırdı.

And olsun ki, mən Əqabə[57] gecəsi İslama kömək etmək üçün bizdən söz aldıqda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə bir yerdə idim. Hər nə qədər insanlar Əqabədən çox Bədr döyüşünün fəzilətindən danışsalar da mən Əqabəni Bədrə heç nə ilə dəyişməzdim[58]. Mənim Təbuk döyüşündə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə iştirak etməməyimə gəlincə (o, da bu cür baş vermişdi).

«Həqiqətən mən o, vaxt Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən geri qalıb döyüşə getmədiyim an heç vaxt olmadığı kimi güclü və maddi cəhətdən təminatlı idim. Allaha and olsun ki, bu döyüşdən əvvəl heç bir vaxt iki dəvəm olmamışdır. Lakin bu döyüş ərəfəsində iki dəvəm vardı. O, ki qaldı Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə, döyüşə çıxmağı arzuladığı zaman getdiyi istiqamətin tam əksinə işarə edərdi[59]. Döyüşə isə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – havanın çox isti vaxtında çıxmışdı. Səfər

---

[54] Buxari 1121, 2661, Müslim 2770.

[55] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – **27** bəzi mənbələrə görə **29** döyüşdə iştirak etmişdir. Bunlardan yalnız doqquzunda özü şəxsən döyüşmüşdür. 1. Bədr, 2. Uhud, 3. Xəndək, 4. Bəni Qureyzə, 5. Bəni Mustələq, 6. Xeybər, 7. Fəth, 8. Huneyn, 9. Taif, Təbuk. Bu döyüşlərin dördündə müsəlmanlara Mələklər kömək ediblər. Bədr-Hicri **2**-ci il, Uhud-Hicri **3**-cü il, Xəndək-Hicri **5**-ci il (Bu döyüşə həmçinin Əhzab döyüşü də deyillər), Huneyn-Hicri **8**-ci ili Şəvvalın 6-sı Məkkənin fəthindən **16**-ı gün sonra.

[56] Mədinədən **150** km aralıda yerləşən quyuların adı idi. Bəzi rəvayətlərə görə o, ərazinin sahibi Bədr b. Kəlbə olduğu üçün onun adından götrülmüşdür. Hicri **2**-ci ili **624**-cü il Ramazan ayının **27**-si Cümə günündə olmuşdur. Müsəlmanlar **319** mücahid ilə **950-1000** nəfərlik düşmənə qarşı vuruşub qalib gəlmişlər.

[57] Məkkə yaxınlığında bir yerin adıdır. **620**-ci ildə birinci Əqabə beyəti, **621**-ci ildə isə ikinci Əqabə beyəti olmuşdur.

[58] Kəb b. Məlik – *radıyallahu anhu* – Əqabə beyətini Bədr döyüşündən üstün tutur. Çünki Əqabə beyəti Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Məkkədən Mədinəyə hicrətindən əvvəl olmuşdur.

[59] Düşmənlərə, münafiqlərə bildirməmək üçün. Onlardan gizli saxlamaq üçün belə edərdi.

uzaq və təhlükəli olmaqla yanaşı çox sayda olan düşmənin üzərinə yönəlmişdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu döyüşə hazırlaşsınlar deyə müsəlmanlara vəziyyəti bildirdi və onlara gedəcəkləri istiqaməti söylədi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə bu döyüşə çıxan müsəlmanların sayı çox idi. (Onların) adlarının yazıldığı bir siyahı da yox idi».

Kəb: «Döyüşə qatılmayanlar çox az sayda idilər. Onlar da elə zənn edirdilər ki, bu haqda heç kəs bilməyəcəkdir. Lakin bu Allah – *subhənəhu və təalə* – nin onlar haqqında ayə nazil etməsinə qədər davam etmişdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu döyüşə meyvələrin yetişdiyi və ağacların gözəl kölgə verdiyi vaxt çıxmışdı. Mən isə bunlara çox meylli idim». «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – və döyüşə gedən müsəlmanlar öz hazırlıqları ilə məşğul olurdular. Mən də onlarla birlikdə yola hazırlaşmaq üçün evdən çıxar və heç bir iş (hazırlıq) görmədən evə qayıdardım. Öz-özümə: (Vaxta hələ var) istədiyim vaxt bunu edə bilərəm» deyirdim. Müsəlmanlar ciddi olaraq bu döyüşə hazırlaşdıqları zaman mən isə heç bir şey hazırlamayıb vaxtımı keçirir-dim. Nəhayət hamı hazır olduqdan sonra səhər tezdən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – və müsəlmanlar səfərə çıxdılar. Mən isə hələ də heç bir şey hazırlamamışdım. (Döyüşə yollananlar) sürətlə irəliləyir və artıq çox uzaqlaşmışdılar. Mən isə qərara gəldim ki, hazırlaşıb onlara çataram. Kaş ki, mən bunu edə bilərdim! Lakin bu da mənə müyəssər olmadı. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – və (müsəlmanlar) döyüşə çıxdıqdan sonra insanlar arasında dolaşdıqda məni üzən bir şey vardı. (Mən) özüm kimisini orada görmədim. Gördüklərim ya münafiqlik damğası vurulmuş kimsələr, ya da Allah – *subhənəhu və təalə* – nin bəraət qazandırdığı zəif kimsələr idi». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Təbuka çatıncaya qədər məndən heç danışmamışdı. Təbukda səhabələrin əhatəsində oturarkən məni xatırlayaraq: «Kəb b. Məlik nə edir?» deyə buyurmuşdu. Bəni Səlimə qəbiləsindən olan biri: «Ya Rəsulullah! Onu iki paltarı və təkəbbürlüyü (döyüşə gəlməyə) qoymadı!» dedi. Muaz b. Cəbəl: «Vallahi Ya Rəsulullah! Biz Kəb b. Məlik haqqında xeyirdən başqa bir şey bilmirik!» dedi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – heç bir şey deməyib susdu. Bu an düm ağ paltarda bir adam göründü. Peyğəmbər: «Bu Əbu Heysəmə olmalıdır?» deyə buyurdu. Həqiqətən baxdıq ki, gələn Əbu Heysəmə əl-Ənsaridir. Bu kimsəni münafiqlər döyüşə bir sa[60] xurma verdiyi üçün ələ salırdılar.

Kəb: «Artıq Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Təbukdan Mədinəyə doğru yönələrək gəldiyi xəbəri mənə çatdıqda şiddətli hüzn və dərin kədər məni bürüdü. Artıq yalan bəhanələr düşünməyə başladım və öz-özümə: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in qəzəbindən nə ilə qurtula bilərəm?» deyirdim. Hətta ailə üzvlərimin içərisindən ağıllı və ağ saqqal insanlardan məsləhətlər almaq üçün kömək tələb edirdim. Mənə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in (Mədinəyə) yaxınlaşması xəbəri verilincə batil və yalan fikirlər məndən uzaqlaşdı. Artıq başa düşdüm ki, yalan və (boş-boş) sözlərlə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in qəzəbindən qurtara bilməyəcəyəm və düzünü söyləməyi qərara aldım. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhəri Mədinəyə gəldi. Bir səfərdən qayıtdıqda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in ilk olaraq etdiyi iş məscidə gedib orada iki rükət namaz qılar və camaatla oturub söhbət edərdi. Bu dəfə də adəti üzrə bunları yerinə yetirib məsciddə oturarkən Təbuk döyüşünə getməyənlər (bir-bir) gəlib üzrxahlıqlarını bildirir və bu üzrxahlıqlarını and içməklə doğrulayırdılar. (Təbuk döyüşünə) getməyənlərin sayı səksən nəfər idi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onların zahirinə baxaraq üzrxahlıqlarını qəbul edib, iç üzlərini Allaha həvalə edərək onlar üçün bağışlanma diləyirdi. Nəhayət (növbə) mənə gəlib çatdı. Yaxınlaşıb salam verdim. Qəzəbli bir gülüşlə təbəssüm etdi. Sonra mənə: «Yaxınlaş!» buyurdu. Mən də yaxınlaşıb onun yanında oturdum. Mənə: «Nə üçün bizimlə getmədin? Məgər sən beyət etməmişdin?» deyə buyurdu. Kəb: «Ya Rəsulallah! Allaha and olsun ki, səndən başqa bir kimsənin yanında oturmuş olsaydım üzrxahlıq gətirərək qəzəbindən qurtarardım. Mən gözəl danışmaq qabiliyyətinə malikəm. Lakin mən Allaha and olsun ki, qətiyyətlə bilirəm ki, bu gün sənin qəlbini ala biləcək bir yalan uydurub desəm çox keçməz ki, Allah (yalanımın üstünü açaraq) səni mənə daha da qəzəbləndirər. Lakin sənə düzünü desəm yenə də mənə qəzəblənəcəksən. Lakin doğru söyləməklə Uca Allahdan xeyirli sonluq ümüd edirəm. Allaha and olsun ki, mənim döyüşdən geri qalmağımda heç bir üzr yoxdur. Vallahi bu günki gün kimi heç bir zaman bu qədər güclü və bu qədər geniş imkanlara sahib deyildim!». Kəb dedi: «Peyğəmbər: «Bu kimsə həqiqəti söylədi. Ey Kəb! Qalx, Allah sənin haqqında hökmünü verənə qədər gözlə!» deyə buyurdu. Mən də qalxdım. Bəni Səlimə qəbiləsindən olan kimsələr də qalxdılar. Arxadan mənə yaxınlaşaraq: «Vallahi biz bundan əvvəl sənin bir günah etmiş olduğunun şahidi olmamışıq. Sən də digərləri kimi bir üzr gətirib canını qurtarardın. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də sənin üçün Allaha dua edərək bağışlanma diləyərdi və onun duası da sənə kifayət edərdi». Kəb: «Allaha and olsun ki, (Bəni Səlimə) qəbiləsindən olanlar mənim üstümə o, qədər düşdülər ki, bir anlığa geri dönüb dediklərimi geri götürmək istədim. (Bu an) mən onlara: «Mənimlə bərabər bu vəziyyətdə olan bir kimsə varmı?» dedim. Onlar: «Bəli, iki nəfər sənin söylədiyin kimi söylədilər və sənə söylənilən sözlərin eynisi onlara da söyləndi» dedilər. Kəb dedi: «Onlar kimlərdir?» Onlar: «Murra b. Rabia əl-Əşari və Hilal b. Umeyyə əl-Vəqifi» dedilər. Kəb dedi: «Mənə Bədr döyüşündə iştirak etmiş iki saleh kimsənin adlarını çəkdilər. Bunlar mənə söyləndikdə mən də öz (fikirlərimdən) vaz keçib onlardan nümunə götürmək qərarına gəldim».

[60] Bir sa – **4,2125** litrə bərabərdir.

Kəb: «Bundan sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – döyüşə getməyənlər içərisindən yalnız bizim üçümüzlə danışmağı qadağan etdi. Cəmaat da bizdən uzaq durmağa başladılar. Elə bir vəziyyət yarandı ki, hətta yaşadığım torpaq da mənə qəribə gəlirdi. Artıq bu mənim tanıdığım torpaq deyildi. Bu hal əlli gün davam etdi. Mənim iki dostuma gəlincə isə onlar cəmaatdan ayrılaraq evlərinə çəkilib günlərini ağlamaqla keçirirdilər. Mən daha gənc və qüvvətli olduğum üçün evimdən çıxar, cəmaat namazında iştirak edər və bazarları dolaşardım. Lakin heç kimsə mənimlə danışmırdı. Namazdan sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəlib salam verdim. Qəlbimdə: «Görəsən salamıma cavab olaraq dodağını tərpətdimi? Yoxsa yox?» Namazlarımı Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanında qılardım və gizlincə ona baxardım. Namazı qıldıqda o, mənə tərəf baxardı. Lakin mən ona tərəf baxdıqda üzünü dərhal məndən çevirərdi. Bu hal üzərə bir müddət davam etdikdən sonra bir gün evdən çıxıb insanlar içərsində ən çox sevdiyim əmim oğlu Əbu Qatadənin yanına yollandım. Onun bağçasının divarına yaxınlaşıb hasarın üstünə çıxdım. Salam verdim. Allaha and olsun ki, salamımı almadı. Mən: «Ey Əbu Qatadə Allah xatirinə de: «Mənim Allah və Rəsulunu sevdiyimi bilirsənmi?» deyə soruşdum. O, susub cavab vermədi. Mən yenə də: «Allah xatirinə soruşdum!». Yenə də susdu. Üçüncü dəfə yenə də: «Allah xatirinə soruşdum!». Bu dəfə: «Allah və Rəsulu bu haqda daha yaxşı bilir!» deyə cavab verdi. Gözlərim yaşla doldu. Hasardan enib geri qayıtdım.

Bir gün Mədinə bazarlarını dolaşırdım. Bu vaxt Şamdan Mədinəyə ticarət üçün gələn xristian əkinçilərdən biri: «Mənə Kəb b. Məliki göstərin?» deyə soruşurdu. Cəmaatda ona işarə ilə məni göstərməyə başladılar. Əkinçi mənə yaxınlaşıb Qassani məlikindən bir məktub verdi. Mən də yazıb-oxumağı bacardığım üçün məktubu oxudum. Məktubda bunlar yazılmışdır: «Bizə xəbər çatıb ki, dostun səni tərk edib. Lakin Allah sənin təhqir olunmağına və sənə qarşı haqsızlıq edilməsinə imkan verməz. Bizə qoşul sənə qarşı gözəl rəftar edərik!». Məktubu oxuyub: «Bu da bir imtahan deyib, oda atıb yandırdım».

Beləcə (izdirablı) əlli gündən qırx gün keçmişdi. Allahın hökmü isə hələ də gəlməmişdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in elçisi (Xuzeymə b. Sabit) yanıma gəlib dedi: «Allahın Rəsulu, sənə zövcəndən (yoldaşından) ayrı durmağı (ona yaxınlaşmamağı) əmr edir». Mən də: «Qadını boşamalıyam, yoxsa?» dedim. O, da: «Xeyr! Boşama. Sadəcə ondan uzaq dur və ona yaxınlaşma!» dedi. Bu əmr eyni ilə iki dostuma da verilmişdi. Mən də zövcəmə: «Allah bu haqda hökm verincəyə qədər ata evinə get və orada gözlə!» dedim. Hilal b. Umeyyənin zövcəsi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gələrək: «Ya Rəsulullah! Hilal b. Umeyyə qocalmış, ixtiyar çağına çatmışdır. Gücü və qüvvəti qalmamışdır. Xidmətçisi də yoxdur. Ona xidmət etməyimi pis görürsən?» deyə soruşdu. Peyğəmbər: «Xeyr, sən ona xidmət edə bilərsən. Lakin o, sənə yaxınlaşmamalıdır!» deyə buyurdu. Qadın: «Ya Rəsulallah! Allaha and olsun ki, heç bu haqda düşünmür. Bu imtahan (bəla) başlayan gündən bu günə qədər ağlamağdan başqa bir şey bilmir» dedi. Bu hadisədən sonra yaxınlarımdan (qohum-əqraba) bəziləri mənə: «Sən də yoldaşın haqqında Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən izn istə. Axı Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Hilal b. Umeyyənin yoldaşına ona xidmət etməsinə icazə vermişdir» dedilər. Mən də: «Vallahi mən buna görə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən izn istəməyəcəyəm. Nə bilim Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – mənə nə deyəcəkdir. Axı mən cavanam» dedim. Beləcə on gün də gözlədim. Tam əlli gün gəlib keçdi. Səhəri sübh namazını evimin damında qıldıqdan sonra Allah haqqımda buyurduğu kimi: ***«Belə ki, gen dünya onlara dar olmuş, ürəkləri*** *(qəm-qüssədən)* ***təngə gəlib sıxılmışdı».*** *(ət-Tövbə 118).* Nəfsim sıxılmış, yer üzü geniş olmağına baxmayaraq mənə dar gəlirdi. Bu an Səl dağı üzərindən: «Ey Kəb b. Məlik müjdə!» deyə qışqıran birisinin səsini eşitdim. Dərhal səcdəyə qapandım və başa düşdüm ki, artıq rahatlıq gəlmişdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – sübh namazından sonra Allahın tövbələrini qəbul etmiş üç nəfərin xəbərini cəmaata bildirmişdir. İnsanlar da bu xəbəri bizə çatdırmaq üçün gəlirdilər. Məni müjdələmək üçün iki nəfər, biri atla (Zubeyr b. Əvvam), digəri isə Səl dağından qışqıran Əsləm qəbiləsindən olan (Həmzə b. Amr) adında bir nəfər idi. Səsini eşitdiyim müjdəçi mənim yanıma gəlincə əynimdə olan paltarı çıxardıb ona verdim. Allaha and olsun ki, o gün bundan başqa paltarım yox idi. Əmanət olaraq (Əbu Qatadədən) iki paltar aldım. Geyinib Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına yollandım. Yolda insanlar axın-axın məni qarşılayır və tövbəmin qəbul olunmasından ötrü məni təbrik edirdilər. Allahın tövbəmi qəbul buyurduğuna görə «Mübarək olsun sənə!» deyirdilər. Nəhayət məscidə girdim. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabələrin əhatəsində oturmuşdu. Təlhə b. Ubeydullah – *radıyallahu anhu* – məni görcək dərhal yerindən qalxaraq mənə tərəf yürüyüb əlimi sıxdı, təbrik etdi. Vallahi mühacirlərdən Təlhə – *radıyallahu anhu* – dan başqa heç kəs ayağa qalxmadı. Mən onun bu əməlini heç vaxt unutmadım».

Kəb: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə salam verdim. Onun üzü sevincdən parıldayırdı. O, buyurdu: «Anan səni doğduğu gündən bəri (bu günə kimi) sənin üçün bu gün ən xeyirli gündür! Müjdə sənə!». Mən: «Ya Rəsulullah! Bu müjdə sən tərəfindəndir, yoxsa Allah tərəfindən!» dedim. Peyğəmbər: «Xeyr, bu Uca Allah tərəfindəndir!» deyə buyurdu. Sevindirici bir hadisə baş verdikdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in mübarək üzü ay parçası kimi parlayırdı və biz də onun mübarək üzünə baxdıqda bu (sevinci) hiss edirdik. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına yaxınlaşıb oturdum. Ya Rəsulallah! Tövbəmin qəbul olunmasına görə malımın hamısını Allah və Rəsulu üçün kasıblara

paylamaq istəyirəm. Peyğəmbər: «Yaxşı olar ki, bir hissəsini özün üçün saxlayasan. Bu sənin üçün daha xeyirli olar» deyə byurdu. Mən: «Xeybərdəki payıma düşən hissəmi özümə saxladım». «Ya Rəsulullah! Allah məni yalnız doğru söylədiyim üçün bu imtahandan qurtardı. Həyatım boyu doğru olmayan başqa bir söz söyləmərəm» dedim. Mən: «Vallahi bunu Peyğəmbər – *sallallahu aleyhi və sələm* – ə söylədikdən sonra müsəlmanlardan elə bir kimsə tanımıram ki, doğru danışdığına görə Allahın mənə göstərdiyi imtahandan daha yaxşısını ona göstərmiş olsun. Vallahi mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə bu sözləri söylədikdən sonra bu günə qədər bilərək yalan danışmamışam. Ümüd edirəm ki, nə qədər ömrüm qalıbsa Allah məni (yalan danışmaq-dan) qoruyacaqdır».

Kəb: ***«Allah çətin saatda bir qisminin ürəyi*** *(şəkk-şübhəyə düşüb peyğəmbərdən və cihaddan)* ***dönmək üzrə ikən Peyğəmbərə, onun ardınca gedən mühacirlərə və ənsara tövbə nəsib etdi. Sonra Allah onlara qarşı şəfqətli və mərhəmətli olduğu üçün tövbələrini qəbul buyurdu. Həmçinin*** *(Təbuk döyüşündən)* ***geri qalmış üç nəfərin də*** *(tövbələrini qəbul etdi).* ***Belə ki, gen dünya onlara dar olmuş, ürəkləri*** *(qəm-qüssədən)* ***təngə gəlib sıxılmışdı. Onlar Allahdan*** *(Allahın əzabından)* ***yalnız onun özünə sığınmağın mümkün olduğunu başa düşdüler. Allah onlara tövbə etmək üçün tövbə nəsib etdi. Şübhəsiz ki, Allah tövbələri qəbul edəndir və rəhimlidir. Ey iman gətirənlər! Allahdan qorxun və*** *(imanında, sözündə, işində)* ***doğru olanlarla olun!».*** *(ət-Tövbə 117-119).*

Kəb: «Vallahi Allahın mənə ehsan buyurduğu nemətlər içərisində məni İslama hidayətindən sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə doğru söyləməyim və məni yalan söyləyib yalanları nəticəsində həlak olanlardan etməməsidir. Həqiqətən Allah yalan söyləyənlər haqqında vəhy endirəndə hər hansı bir kimsəyə söylənəbiləcək ən pis şeyi söyləmişdir. ***«Yanlarına qayıtdığınız zaman onlardan üz döndərməməniz, onları məzəmmət etməməniz üçün*** *(yalandan)* ***Allaha and içəcəklər. Siz də onları məzəmmət etməyin. Çünki onlar murdardırlar və qazandıqları günahlara görə düşəcəkləri yer də cəhənnəmdir. Onlardan razı olsınız deyə, qarşınızda*** *(Allaha)* ***and içəcəklər. Siz onlardan razı olsanız da, Allah fasiq bir tayfadan razı olmaz!».*** *(ət-Tövbə 95-96).*

Kəb: «Biz üçümüz o, biriləri kimi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə and içdikləri və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də onların andlarını qəbul edib (onlar) üçün bağışlanma dilədiyi vaxt onlardan geri qaldıq. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizim bu işimizi Allahın bu haqda hökmü gəlincəyə qədər təxirə saldı. Allah buyurdu: *«…**Həmçinin** (Təbuk döyüşündən) **geri qalmış üç nəfərin də** (tövbələrini qəbul etdi). (ət-Tövbə 118).* Bu ayədə qeyd olunan «Geri qalanlar» ifadəsi heç də bizim Təbuk döyüşündə geri qalmağımız deyildir. Əksinə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizi və bizim tövbələrmizin, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə and içərək üzrxahlıq gətirənlərin hökmündən sonraya buraxılması mənasındadır». Başqa rəvayətdə - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Təbuk döyüşünə dördüncü günü çıxmış və (ümumən) dördüncü günü səfərə çıxmağı xoşlayardı. Başqa rəvayətdə - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – öz səfərlərində səhər Duha namazı vaxtı qayıtmağı xoşlayardı[61].

## ONUNCU HƏDİS
### (ELM ÖYRƏNMƏYİN FƏZİLƏTİ)

***«Allahdan öz bəndələri içərisində ancaq alimlər qorxar».*** *(Fatir 28).* ***«Allah da sizdən iman gətirənlərin və*** *(xüsusilə)* ***elm bəxş edilmiş kimsələrin dərəcələrini ucaltsın. Allah etdiyiniz əməllərdən xəbərdar-dır!»*** *(əl-Mücadələ 11).* ***«Allah istədiyi şəxsə hikmət bəxş edər. Kimə hikmət bəxş edilmişsə ona çoxlu xeyir verilmişdir. Bunu ancaq ağıllı adamlar dərk edərlər».*** *(əl-Bəqərə 269).*

Əbu Musa – *radyallahu anhu* – rəvayət etdi ki, Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – buyurdu: «Allah – *subhənəhu və təalə* – nin mənim vasitəmlə (insanlara) göndərdiyi Hidayət və Elm torpağa düşən yağmura bənzər. (Bu torpaqların hər biri yağmuru bir cür qəbul edər). Torpağın bir hissəsi bərəkətlidir. Üzərindəki suyu özünə çəkib bol ot və bitki bitirər. (Digər bir hissəsi isə) doymuş torpaqdır. Suyu (özünə çəkməyib) üzərində saxlayar və Allah – *subhənəhu və təalə* – də onu (suyu) (insanların) istifadəsinə yönəldər. İnsanlar da həm özləri içər, həm heyvanlarını suvarar, həm də (əkində) suvarmaq üçün istifadə edərlər. Yağmurun düşdüyü digər bir qisim torpaqda vardır ki, düz və qurudur. (Bu torpaq) nə suyu öz üzərində saxlayar, nə də ot və bitki bitirər. (Torpağın bu hissələri) O, kimsələrə bənzəyir ki, onlar Allahın dinini anlayıb (qəbul edib), Allahın mənim vasitəmlə (insanlara) göndərdiyi (Hidayət və Elmdən) faydalanıb, özləri elm alıb və (o, elmi) başqalarına ötürüblər. Həmçinin də o, kimsələr ki, (Allahın dinini anlayıb) lakin onu qəbul etməyən, başlarını da belə qaldırmayan və Allahın mənim vasitəmlə (insanlara) göndərdiyi Hidayəti qəbul etməyən kimsələrin misalıdır»[62].

Suheyb – *radyallahu anhu* – rəvayət etdi ki, Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən əvvəlki ümmətlərdə bir hökmdar və onun bir sehrbazı vardı. Sehrbaz yaşlandıqda hökmdara: «Artıq mən qocalmışam. Mənə bir uşaq göndər ki, ona sehr elmini öyrədim!» dedi. Hökmdar da ona (sehrbaza) sehri

[61] Buxari 4418, Müslim 2769.
[62] Buxari 79, Müslim 2282.

öyrətsin deyə bir uşaq göndərdi. (Uşaq da hər gün sehrbazın yanına gəlib-gedərdi). Uşağın (sehrbazın yanına getdiyi) yolunun üzərində bir rahib vardı. Uşaq (sehrbazın yanına getməmişdən əvvəl) rahibin yanında oturar, sözlərini dinləyər və (rahibin dediyi bu sözlər) onun xoşuna gələrdi. Artıq hər dəfə sehrbazın yanına getdikdə (yol üstü) rahibin yanına gedər və onun yanında oturub (sözlərini dinləyərdi). Bu səbəbdən də hər dəfə sehrbazın yanına gec gəldiyi üçün (sehrbaz) onu döyərdi. Uşaq döyülməsindən rahibə şikayət etdi. Rahib: «Əgər sehrbazdan qorxsan de ki, evdən gec buraxıblar, yox əgər ailəndən qorxsan de ki, sehrbaz məni gec buraxıb!». Uşaq bu minvalla gedib-gələrkən bir gün camaatın yolunu kəsmiş böyük bir heyvana rast gəldi. Uşaq: «Həqiqətən mən bu gün biləcəyəm sehrbazmı daha fəzilətlidir? Yoxsa rahibmi?» dedi. Yerdən bir daş götürüb: «Allahım əgər rahibin əməlləri sənin üçün sehrbazın əməllərindən sevimlidirsə bu heyvanı öldür və insanlar da rahat gedib-gələ bilsinlər!» deyə dua etdi və daşı heyvanın üstünə atdı. Heyvan öldü. İnsanların da gediş yolu rahatlandı. Bundan sonra uşaq rahibin yanına gəlib baş verən hadisəni ona danışdı. Rahib: «Oğlum! Bu gün sən artıq məndən də fəzilətlisən. Artıq mən görürəm ki, sən yüksək dərəcələrə çatmısan və qarşıda bir çox bəlalara (imtahanlara) məruz qalacaqsan. Əgər belə bir bəlalara (imtahanlara) məruz qalsan yerimi heç kimə bildirmə!» dedi. Bundan sonra uşaq anadan gəlmə korları, cüzəm xəstəliyinə tutulanları və digər başqa ağır xəstələri sağaltmağa başladı. Hökmdarın yaxın adamlarından biri (vəziri) kor idi. Bu haqda eşitdikdə bir çox hədiyyələrlə uşağın yanına gəlib və: «Əgər mənə şəfa verə bilsən bu gətirdiyim hədiyyələrin hamısı sənin olacaqdır!» dedi. Uşaq: «Mən heç kimə şəfa vermirəm. Şəfanı ancaq Allah verir. Əgər Allaha iman gətirsən Allaha dua edərəm ki, sənə şəfa versin!» deyə cavab verdi. Bundan sonra o, kor Allaha iman etdi. Allah da ona şəfa verdi.

Sonra (həmin adam) öz hökmdarının yanına qayıdıb, hər zaman olduğu kimi onun yanında oturdu. Hökmdar: «Sənə gözünü kim geri qaytardı?» deyə soruşdu. O: «Rəbbim?» deyə cavab verdi. Hökmdar: «Sənin məndən başqa Rəbbin varmı?» deyə soruşdu. O: «Mənim də Rəbbim, sənin də Rəbbin Allahdır?» deyə cavab verdi. Hökmdar onun tutulmasını əmr etdi və uşağın yerini deyincəyə qədər ona işgəncələr verməyə başladılar. (Vəzir işgəncələrə dözməyib uşağın yerini dedi). Nəhayət uşaq gətirildi. Hökmdar: «Oğlum! Sehrinlə anadan gəlmə korları, cüzəm xəstəliyinə tutulanları sağaltmaq dərəcəsinə yüksəlmisən. (Ayrıca) daha başqa xeyirli əməllərin də vardır!». Uşaq: «Şübhəsiz ki, mən heç kimə şəfa vermirəm. Şəfanı verən ancaq Allahdır!» dedi. Hökmdar: «Uşağın tutulub rahibin yerini deyincəyə qədər işgəncə verilməsini əmr etdi!». Uşaq işgəncələrə dözməyib rahibin yerini dedi. Rahib gətirildi. Ona: «Dinindən dön?» deyildi. Lakin o, dönmədi. Hökmdar mişarın gətirilməsini əmr etdi. Mişarı rahibin başının tən ortasından qoyaraq iki hissəyə böldülər. Hətta başının bir hissəsi yerə düşdü. Sonra hökmdarın yaxın adamı (vəziri) gətirilir. Ona da: «Dinindən dön?» deyildi. Lakin o, da dönmədi. Mişarı onun da başının ortasından qoyaraq bir hissəsi yerə düşənə qədər iki hissəyə böldülər. Sonra uşağı gətirib ona da: «Dinindən dön?» deyildi. O, da dönmədi. Hökmdar uşağı adamlarından bir neçəsinə verib dedi: «Uşağı götürüb filan dağın başına çıxın. Dağın təpəsinə çatdıqda əgər dinindən dönərsə (buraxın), yox əgər dönməzsə onu dağdan aşağı buraxın!». Onlar uşağı götürüb dağa çıxmağa başladılar. Uşaq: «Ya Rəbbim! Məni onlardan özün istədiyin (dilədiyin) kimi qoru!» deyə dua etdi. Bu an dağ sirkələnməyə başladı. Hökmdarın adamları dağdan aşağı yuvarlanıb öldülər. Uşaq isə hökmdarın yanına qayıtdı. Hökmdar: «Mənim göndərdiyim adamlara nə oldu?» deyə soruşdu. Uşaq: «Allah məni onlardan qorudu!» dedi. Hökmdar bir dəstə də düzəldib uşağı onlara verib dedi: «Uşağı götürüb böyük bir gəmiyə mindirin və dənizin ortasına doğru üzün. Dinindən dönərsə (buraxın), yox əgər dönməzsə (dənizə) atın. Onlar uşağı götürüb deyilən yerə çatdılar. Uşaq: «Ya Rəbbim! Məni onlardan özün istədiyin (dilədiyin) kimi qoru!» deyə dua etdi. Duanı bitirən kimi gəmi batmağa başladı. Hökmdarın adamları suya qərq oldular. Uşaq isə hökmüdarın yanına qayıtdı. Hökmdar: «Mənim göndərdiyim adamlara nə oldu?» deyə soruşdu. Uşaq: «Allah məni onlardan qorudu!» dedi. Uşaq sözünə davam edərək: «Sən mənim dediklərimi yerinə yetirmədən məni öldürə bilməzsən!» dedi. Hökmdar: «Nədir o?» dedi. Uşaq: «Camaatı bir meydana topla, məni də bir xurma ağacına bağla. Sonra oxumdan birini götürüb yayın ortasına qoyaraq: «***BİSMİLLƏHİ RABBİL ĞULƏM*** - Uşağın Rəbbi olan Allahın adı ilə!» de və sonra oxu at. Belə etdikdə məni öldürə bilərsən!» dedi. Hökmdar camaatı bir meydançaya topladı və uşağı da xurma ağacına bağladı. Uşağın dediyi kimi oxlardan birini götürüb yayın ortasına qoyaraq ***BİSMİLLƏHİ RABBİL ĞULƏM -*** Uşağın Rəbbi olan Allahın adı ilə! deyərək oxu atdı. Ox uşağın alnına batdı. Uşaq əlini alnına qoyub öldü. Bu zaman camaat: «Biz uşağın Rəbbinə iman etdik! Biz uşağın Rəbbinə iman etdik! Biz uşağın Rəbbinə iman etdik!» dedilər. Daha sonra hökmdarın adamları: «Gördünmü? Qorxduğun şey başına gəldi. Artıq camaat iman etdi!» dedilər. Hökmdar dərhal yol ağızlarında xəndəklər qazılmasını əmr etdi[63]. Xəndəklər qazıldı, içərsində od qalandı. Hökmdar: «Atın özünüzü xəndəklərə!» deyə əmr etdi. «Hər kim dinindən dönməzsə onu xəndəyə atın!» dedi. Hökmdarın adamları əmri yerinə yetirərək insanları odla dolu xəndəklərə atmağa başladılar. Nəhayət növbə yanında körpə uşaq olan bir qadına gəldi. Qadın odla dolu xəndəyə düşməkdən qorxaraq geri çəkildi. Bu an körpə uşaq dilə gələrək: «Anacan! Səbr et, şübhəsiz ki, sən haqq üzərindəsən!» dedi[64].

[63] əl-Buruc surəsinin **4-10**-cu ayələrinə baxa bilərsiniz.
[64] Müslim 3005.

# ON BİRİNCİ HƏDİS
## (ELM MƏCLİSLƏRİNİN FAYDALARI)

***«Ayələrimizi istehza edənləri gördüyün zaman onlar söhbəti dəyişənə qədər onlardan üz çevir. Əgər şeytan** (bu qadağan əmri) **sənə unutdursa, xatırlayandan sonra o, zalim tayfa ilə bərabər oturma».** (əl-Ənam 68). **«Allah Quranda nazil etmişdir** (bildirmişdir) **ki, Allahın ayələrinin inkar edildiyini və onlara istehza olunduğunu eşitdiyiniz zaman müşriklər başqa bir söhbətə girişməyənə qədər onlarla bir yerdə əyləşməyin! Çünki o, vaxt siz də onların tayı olarsınız».** (ən-Nisa 140).*

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Uca Allahın yer üzündə yolları dolaşıb zikr əhlini (məclislərini) axtaran bir qrup mələkləri vardır. Bu mələklər İzzət və Qüdrət sahibi olan Allahı zikr edən bir topluluğu tapdıqda bir-birlərinə: «Gəlin, axtardıqlarınız buradadır!» deyə səsləyirlər və zikr əhlini (məclisini) dünya səmasına qədər qanadlarıyla əhatəyə alırlar. (Zikr əhli Allahı yad edib qurtardıqdan sonra mələklər səmaya qalxarlar) Hər bir şeydən xəbərdar olan Allah – *subhənəhu və təalə* – onlara: «Qullarım nə haqda danışırdılar?» deyə buyurar. Mələklər: «Onlar Səni ***TƏSBİH***[65] edirdilər, Səni ***TƏKBİR***[66] edirdilər, Səni ***TAHMİD***[67] edirdilər və Səni təzim edirdilər!» deyərlər. Allah: «Məgər onlar Məni görüblərmi?» deyə buyurar. Mələklər: «Xeyr, Allaha and olsun ki, onlar Səni görməyiblər!». Allah: «Əgər onlar Məni görsəydilər necə?». Mələklər: «Əgər onlar Səni görsəydilər Sənə daha çox ibadət edər, Sənə daha çox təzim edər və Səni daha çox təsbih edərdilər». Allah: «Onlar Məndən nə istəyirlər?». Mələklər: «Onlar Səndən Sənin Cənnətini istəyirlər!». Allah: «Onlar Mənim Cənnətimi görüblərmi?». Mələklər: «Xeyr, Allaha and olsun ki, onlar Sənin Cənnətini görməyiblər!». Allah: «Əgər onlar Mənim Cənnətimi görsəydilər necə?». Mələklər: «Əgər onlar Sənin Cənnətini görsəydilər onu qazanmaq üçün daha həris, daha istəkli və daha rəğbətli olardılar! (ora düşmək üçün)». Allah: «Onlar nədən sığınmağa çalışırdılar?». Mələklər: «Cəhənnəm atəşindən!». Allah: «Məgər onlar Mənim Cəhənnəmimi görüblərmi?». Mələklər: «Xeyr, Allaha and olsun ki, onlar Sənin Cəhənnəmini görməyiblər!». Allah: «Əgər onlar Mənim Cəhənnəmimi görsəydilər necə?». Mələklər: «Əgər onlar Sənin Cəhənnəmini görsəydilər ondan daha çox (sənə) sığınar (qaçar) və daha çox qorxardılar!». Allah: «O, halda sizlər şahid olun ki, mən onları bağışladım!» deyə buyurdu. Bu an mələklərdən biri: «Onların arasında bir kimsə var ki, onlardan deyildir. Yalnız bir ehtiyac (bir iş) üçün onların yanına gəlmişdir!» dedi. Allah: «Onlar elə bir kslərdir ki, onlarla oturan kimsə bədbəxt olmaz!» deyə buyurdu[68]. Başqa rəvayətdə - Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, Allahın yer üzündə dolaşan bir qrup mələkləri vardır. Bu mələklər zikr məclislərini axtararlar. Nəhayət onlar Allahı zikr edən bir məclisi tapdıqda onlarla birlikdə oturar və bir-birlərini qanadları ilə əhatəyə alarlar. O, vaxta qədər ki, dünya ilə səma arasını doldurarlar. Zikr əhli dağıldıqdan sonra (mələklər) səmaya yüksələrlər. Hər şeydən xəbərdar olan Allah qullarının halını mələklərdən daha yaxşı bildiyi halda mələklərə: «Siz haradan gəlirsiniz?» deyə buyurar. Mələklər: «Biz yer üzündə Sənin bir qrup qullarının yanından gəlirik ki, onlar Səni ***TƏSBİH*** edir, Səni ***TƏKBİR*** edir və Səndən başqa ibadətə layiq haqq ilah olmaığını ***TƏHLİL*** edir, Səni ***TƏHMİD*** edir və Səndən istəyirlər!». Allah: «Onlar Məndən nə istəyirlər?». Mələklər: «Onlar Səndən Sənin Cənnətini istəyirlər!». Allah: «Məgər onlar Mənim Cənnətimi görüblərmi?». Mələklər: «Xeyr, ey Rəbbimiz! Onlar Sənin Cənnətini görməyiblər!». Allah: «Əgər onlar Mənim Cənnətimi görsələrdi necə olardı?». Mələklər: «Onlar Səndən aman istəyirlər?». Allah: «Nəyə qarşı Məndən aman (sığınacaq) istəyirlər?». Mələklər: «Cəhənnəm atəşinə qarşı!». Allah: «Onlar Mənim atəşimi görüblərmi?». Mələklər: «Xeyr, onlar Sənin atəşini görməyiblər». Allah: «Əgər onlar Mənim atəşimi görsələrdi necə olardı?». Mələklər: «Onlar Səndən məğfirət diləyirlər?». Allah: «(Siz şahid olun ki) Mən onları bağışladım, istədiklərini onlara verdim və onları aman (sığınacaq) istədikləri şeydən qorudum!». Mələklər: «Ey Rəbbimiz! Onların arasında çox günahkar bir qulun da vardır. Sadəcə onların yanından keçərkən onlarla oturdu!». Allah: «Mən onu da bağışladım. Onlar elə bir topluluqdur ki, onlarla oturub-duran kimsə bədbəxt olmaz!» deyə buyurdu[69].

# ON İKİNCİ HƏDİS
## (ALLAHIN SİZƏ VERDİYİ MALDAN ALLAH YOLUNDA XƏRCLƏYİN)

***«Mallarını Allah yolunda sərf edənlərin halı yeddi sünbül verən bir toxuma bənzər ki, bu sünbüllərin hər birində yüz ədəd dən vardır. Allah istədiyi şəxs üçün bunu qat-qat artırır. Allahın lütfü genişdir. O, hər şeyi biləndir. Heç bir kəsə minnət qoymadan, əziyyət vermədən mallarını Allah yolunda sərf edənlərin Rəbbi yanında mükafatları böyükdür».** (əl-Bəqərə 261,262). **«Yoxsullara aşkarda verməyiniz yaxşıdır,***

---

[65] ***SUBHƏNƏLLAH***
[66] ***ALLAHU ƏKBƏR***
[67] ***ƏLHƏMDULİLLƏH***
[68] Buxari 6408.
[69] Müslim 2689.

***lakin onu gizlində versəniz daha yaxşı olar… Malınızdan sərf etdiyiniz hər hansı bir şeyin xeyiri ancaq özünüz üçündür. Siz onu yalnız Allahın razılığını qazanmaq üçün verirsiniz. Malınızdan verdiyiniz hər hansı bir şeyin əvəzi tamamilə sizə ödəniləcəkdir. Sizə əsla zülm edilməz».*** *(əl-Bəqərə 271-272).*

Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Bir kimsə: «Mən mütləq (bu gün) bir sədəqə verəcəyəm!» deyib evindən çıxdı (bilmədən) sədəqəsini bir oğruya verdi. Səhəri insanlar: «(Bu gecə) oğruya sədəqə verilmişdir» deyə danışmağa başladılar. O, da: «Allahım! Şükürlər olsun sənə! (Bu gün) yenə də sədəqə verəcəyəm!» deyib evindən çıxdı (yenə də bilmədən) sədəqəsini bir fahişəyə verdi. Səhəri insanlar: «(Bu gecə) fahişəyə sədəqə verilmişdir» deyə danışmağa başladılar. O, da: «Allahım! Şükürlər olsun sənə! (Mən sədəqəni) bir fahişəyə vermişəm» deyib və yenə də mən mütləq sədəqə verəcəyəm deyə niyyət edib evindən çıxdı. Bu dəfə də sədəqəni varlı bir kimsəyə verdi. Səhəri insanlar: «(Bu gecə) varlıya sədəqə verilmişdir» deyə danışmağa başladılar. O, da: «Allahım! Oğruya, fahişəyə və varlıya verdiyim sədəqəyə görə şükürlər olsun sənə!» dedi. Bundan sonra onun yanına biri gəlib (yəni yuxuda görür ki, biri onun yanına gəlib deyir): «Oğruya verdiyin sədəqəyə gəlincə bəlkə (bu sədəqə) onun oğurluq etməkdən çəkinməsinə (səbəb ola) bilər, fahişəyə verdiyin sədəqə isə bəlkə onun zinadan əl çəkməsinə (səbəb ola) bilər, varlıya verdiyin sədəqəyə gəldikdə isə bəlkə o, bundan ibrət alıb Allahın ona verdiyi nemətdən xərcləyər»[70].

Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «(Bir gün) bir nəfər geniş və susuz bir səhrada gedərkən (qəflətən) buluddan: «Filankəsin bağçasını sula!» deyə bir səs eşitdi. Sonra bulud dərhal bağçaya tərəf yönələrək suyunu qara, daşlı bir sahəyə boşaltdı. Su isə bir yerə toplanaraq böyük kanal meydana gətirdi. O, kimsə suyu təqib edərək (suyun) axarı ilə getməyə başladı. Nəhayət (bir müddətdən sonra) öz bağçasının içərsində dayanmış bir kimsənin yanına çatdı. O, kimsə axan suyu kanallar vasitəsilə (istədiyi yerə) yönəldirdi. Ona: «Ey Allahın qulu! Adın nədir?» deyə soruşdu. O, da: «Filankəsdir!» dedi və buluddan eşitmiş olduğu adı (ona) söylədi. (Bağ sahibi): «Ey Allaın qulu! Nədən mənim adımı soruşursan?» dedi. O, da: «Mən bu suyu axıdan buludun içərisindən sənin adını verərək: «Filankəsin bağçasını sula!» deyə bir səs eşitdim. (Mənim üçün maraqlıdır) sən bu bağçada nə edirsən ki, (Allah sənə bu cür kəramət verib) dedi. (Bağ sahibi): «Madam ki, soruşursan onda mən sənə cavab verərəm» dedi. «Mən bu bağçadan çıxan məhsula baxır və (hesabat aparıram). Sonra çıxan məhsulun üçdə birini heç bir imkanı olmayan fəqirlərə, kasıblara verirəm. Üçdə birini özümə və ailəmə saxlayıram. Qalan üçdə birini isə torpağa (məhsul üçün) qaytarıram»[71].

## ON ÜÇÜNCÜ HƏDİS
### (XEYİRLİ İŞLƏR GÖRMƏYƏ TƏLƏSMƏK)

***«****(Ey müsəlmanlar!)* ***Yaxşı işlər görməkdə bir-birinizi ötməyə çalışın!».*** *(əl-Bəqərə 148).*

Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Uca Allah Qiyamət günü buyuracaq: «Ey Adəm oğlu! Mən xəstə idim, Sən isə məni ziyarət etmədin!» (Adəm oğlu): «Ya Rəbbim! Sən aləmlərin Rəbbi olduğun halda mən Səni necə ziyarət edə bilərəm?» deyə soruşacaq. Allah: «Məgər sən bilmirdin ki, mənim filan qulum xəstələnib sən də onu ziyarət etmədin? Məgər sən bilmirdin ki, əgər onu ziyarət etsəydin məni də onun yanında tapardın!» deyə buyuracaq. Allah: «Ey Adəm oğlu! Mən səndən yeyəcək istədim sən isə mənə yeyəcək vermədin!» deyə buyuracaq. (Adəm oğlu): «Ya Rəbbim! Sən aləmlərin Rəbbi olduğun halda mən Səni necə yedirdə bilərdim?» deyə soruşacaq. Allah: «Məgər sən bilmirdin ki, mənim filan qulum səndən yemək istəmişdi, sən də onu yedirtmədin! Məgər sən bilmirdin ki, əgər onu yedirtsəydin şübhəsiz ki, onun (savabını) mənim yanımda tapardın!» deyə buyuracaq. Allah: «Ey Adəm oğlu! Mən səndən su istəmişdim sən isə mənə vermədin!» deyə buyuracaq. (Adəm oğlu): «Ya Rəbbim! Sən aləmlərin Rəbbi olduğun halda mən Sənə necə su verə bilərəm?» deyə soruşacaq. Allah: «Məgər səndən filan qulum su istəməmişdi, sən isə ona vermədin. Əgər sən ona su vermiş olsaydın şübhəsiz ki, onun (savabını) mənim yanımda tapardın!» deyə buyurdu[72].

## ON DÖRDÜNCÜ HƏDİS
### (ALLAH *– subhənəhu və təalə –* nin RƏHMƏTİNİN GENİŞLİYİ)

***«Ey möminlər! Hamınız Allaha tövbə edin ki, bəlkə nicat tapasınız!»*** *(ən-Nur 31).* ***«Ey iman gətirənlər! Allaha səmimi-qəlbdən*** *(bir daha günaha qayıtmamaq şərtilə)* ***tövbə edin!»*** *(ət-Təhrim 8).* ***«Mərhəmətim hər şeyi ehtiva etmişdir!».*** *(əl-Əraf 156).* ***«****(Ya Məhəmməd! Mənim adımdan qullarıma)* ***De ki: Ey mənim*** *(günah törətməkdə)* ***özlərinə zülm etməkdə həddi aşmış bəndələrim! Allahın rəhmindən ümidsiz olmayın!***

---

[70] Buxari 1421, Müslim 1022.
[71] Müslim 2948.
[72] Müslim 2569.

***Allah** (tövbə etdikdə) **bütün günahları bağışlayar. Həqiqətən O, bağışlayan və rəhm edəndir. Tövbə edib Rəbbinizə dönün. Əzab sizə gəlməmişdən əvvəl Ona təslim olun. Sonra sizə heç bir kömək olunmaz!»** (əz-Zumər 53-54) **«O, müttəqilər ki, bir günah iş gördükləri, yaxud özlərinə zülm etdikləri zaman Allahı yada salıb** (tövbə edərək) **günahlarının bağışlanmasını istəyərlər. Axı günahları Allahdan başqa kim bağışlaya bilər?»** (Ali İmran 135).*

Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Uca və Böyük olan Rəbbindən belə buyurdu: «Allahın qullarından biri günah edib sonra da: «Allahım! Mən günah etdim, günahımı bağışla!» dedi. Pak və Uca olan Allah: «Qulum günah etdi! Günahı bağışlayan (məğfirət edən) və günaha görə cəzalandıran Rəbbi olduğunu bildiyi halda! Mən öz qulumu bağışladım!» deyə buyurdu. Sonra o, qul (günah etmədən) Allahın dilədiyi bir müddət qədər yaşayır. Sonra yenə də günah edərək: «Allahım! Mən günah etdim, günahımı bağışla!» dedi. Pak və Uca olan Allah: «Qulum günah etdi! Günahı bağışlayan (məğfirət edən) və günaha görə cəzalandıran Rəbbi olduğunu bildiyi halda! Mən öz qulumu bağışladım!» deyə buyurdu. Sonra o, qul (günah etmədən) Allahın dilədiyi bir müddət qədər yaşayır. Sonra yenə də günah edərək: «Allahım! Mən günah etdim, günahımı bağışla!» dedi. Pak və Uca olan Allah: «Qulum günah etdi! Günahı bağışlayan (məğfirət edən) və günaha görə cəzalandıran bir Rəbbi olduğunu bildiyi halda!». Üç dəfə: «Mən öz qulumu bağışladım! Artıq istədiyini edə bilər[73]« deyə buyurdu[74].

Əbu Səid Sad b. Məlik b. Sinan əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən əvvəlki ümmətlərdə doxsan doqquz insan oldürmüş bir kimsə vardı. Bu kimsə (öldürdükdən) sonra yer üzünün ən alim insanını axtarmağa başlayır. Ona (İsrail oğullarından) bir rahibi göstərirlər. O, da rahibin yanına gələrək: «Mən doxsan doqquz insan öldürmüşəm və tövbə etməyin mənə faydası olacaqmı?» deyə soruşdu. Rahib: «Xeyr!» deyə cavab verincə onu da öldürür. Beləcə (öldürdüyü insanların sayını) yüzə çatdırır. Sonra yenə də yer üzünün ən alim insanını axtarmağa başlayır. Ona bir nəfər elmli insanı göstərirlər. Alimin yanına gələrək yüz nəfər öldürdüyünü və tövbə etməyin ona fayda verəcəyi haqqında soruşur. Alim: «Bəli! Tövbə edən insana kim mane ola bilər! Sən filan yerə get! Çünkü orada Allaha ibadət edən bir tayfa vardır. Onlarla birlikdə Allaha ibadət et və bir daha bu məmləkətə qayıtma. Çünkü bura çox pis yerdir! Bu (söhbətdən) sonra adam alimin dediyi yerə yollanır. Lakin yolun yarsına çatdıqda ölüm onu yaxalayır. Bu kimsəyə görə Rəhmət mələkləri ilə əzab mələkləri bir-birləri ilə mübahisəyə başlayırlar. Rəhmət mələkləri: «Bu adam tövbə edərək və qəlbini Allaha yönəldərək gəldi!» deyirlər. Əzab mələkləri: «Bu adam bu günə qədər heç bir xeyir işləməmişdir!» deyirlər. Bu an insan qiyafəsində bir mələk onların yanına gəlir və hər iki tərəf onu öz aralarında hakim təyin edirlər. O, deyir: «Gəldiyi yer ilə gedəcəyi yeri ölçün! Hansı tərəf daha yaxın olarsa ora aiddir!» Mələklər hər iki tərəfi ölçürlər və adamın getdiyi yerə yaxın olduğunu görürlər və Rəhmət mələkləri onun ruhunu alıb gedirlər (aparırlar)». Başqa rəvayətdə: «Uca Allah günahkarların yaşadığı yerə uzaqlaş! Tövbə edib getdiyi yerə yaxınlaş!» deyə vəhy etdi. Və mələklərə: «Hər iki tərəfin məsafəsini ölçün!» deyə buyurdu. Mələklər də hər iki tərəfi ölçdülər. Tövbəkarın gedəcəyi yerə bir qarış yaxın olduğunu gördülər. Bundan ötrü də (Allah) onun günahlarını bağışladı»[75].

## ON BEŞİNCİ HƏDİS
### (GÖZƏL ƏMƏLLƏRLƏ ALLAHA YAXINLAŞMAĞIN YOLLARI)

***«Allahı qoyub özlərinə dost tutanlar: «Biz onlara bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!» Deyirlər.*** *(əz-Zumər 3).* ***«Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərə ibadət edir və: «Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!» deyirlər. De ki: «Allaha göylərdə və yerdə bilmədiyi bir şeyimi xəbər verirsiniz? Allah özünə şərik qoşulan bütlərdən uzaqdır və ucadır».*** *(Yunus 18).*

Əbu AbdurRahmən b. Ömər b. əl-Xəttab – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən əvvəlki ümmətlərdə üç nəfər səfərə çıxırlar. Gecələmək üçün bir mağaraya girmək məcburiyyətində qalırlar. Mağaraya girdikdə bir qaya parçası yuvarlanıb mağaranın ağzını örtür. Onlar bir-birlərinə: «Bizi bu qayadan yalnız əvvəl etmiş saleh əməllərimizlə (Allaha) yaxınlaşmaqla (vasitə) etməklə Allaha yalvarıb-yaxarmağımız qurtara bilər!» dedilər.

Onlardan biri: «Allahım! Mənim qocalıq yaşına çatmış valideyinlərim vardı. Axşamlar (evə gəldikdə) onlara (süd) içizdirmədən nə uşaqlarıma, nə də qulluqçularıma (süd) içizdirərdim. Bir gün otlaq axtarmaq məni çox uzaqlara apardı. Geri qayıtdıqda onları (valideyinlərimi) yatmış gördüm. Hər gün olduğu kimi süd sağdım və onları (valideyinlərimi) yuxudan oyatmamaqdan ötrü səhərə kimi süd qabı ilə başlarının üstündə durdum. Ana və atamdan əvvəl nə uşaqlarıma, nə də qulluqçularıma içirmək istəmədim. Halbuki uşaqlar ayaqlarımın altında aclıqdan ağlayırdılar. Sonra (valideyinlərim) oyanıb axşam onlar üçün sağdığım südü

---

[73] Bu kəlmələr heç də onu açıqlamır ki, insan istədiyini edə bilər. Xeyr! Bu kəlmələr bizə onu açıq-layır ki, insan günah etdikdən sonra dərhal tövbə edərsə Allah onu bağışlayar.
[74] Buxari 7507, Müslim 2758.
[75] Buxari 3470, Müslim 2766.

içdilər. «Allahım! Əgər mən bunu sənin rizanı (rəhmini, mərhəmətini) qazanmaq üçün etmişəmsə onda bizi bu bəladan (vəziyyətdən) qurtar!» deyə dua etdi. Bundan sonra qaya parçası bir az aralandı. Lakin çıxmaq mümkün olmadı.

Onlardan digəri: «Allahım! Mənim bir əmim qızı var idi. İnsanlar içərisində ən çox onu sevirdim. (Başqa rəvayətdə – Mən onu kişilərin qadınları sevməkdə olduqları sevginin ən şiddətli dərəcəsində sevirdim). Mən ona yaxınlaşmaq istədim. Lakin o, məndən üz döndərdi. Bir neçə il keçdikdən sonra (kasıblıq üzündən) mənim yanıma gəldi. Mən də ona mənimlə tək qalmaq şərti ilə yüz iyirmi dinar pul təklif etdim. O, da buna razı oldu. Ona yaxınlaşmaq fürsətini tapmışdım ki, (başqa rəvayətdə – Ayaqlarının arasına çökmüşdüm ki) qız mənə: «Allahdan qorx! (haqsız yerə bakirənin möhürünü açma). Allahın qoyduğu bakirəlik möhürünü yalnız halal yolla (nigah yolundan başqa) bir yolla açma!» dedi. Bu əməldən dərhal vaz keçərək ondan uzaqlaşdım. O, isə insanların mənə ən sevimlisi idi. Onu çox sevdiyimə baxmayaraq. «Allahım! Əgər mən bunu sənin rizanı (rəhmini, mərhəmətini) qazanmaq üçün etmişəmsə onda bizi bu bəladan (vəziyyətdən) qurtar!» deyə dua etdi. Bundan sonra qaya parçası bir az da aralandı. Lakin yenə də çıxmaq mümkün olmadı.

Üçüncü şəxs dedi: «Allahım! Mən işçilər tutmuşdum. Hər birinin də (işlədikdən sonra) haqqını verdim. Birindən başqa. O, haqqını almayıb getdi. Mən onun haqqını (pulunu) dövriyyəyə buraxıb çoxaltdım. Bir müddət keçdikdən sonra o, işçi mənim yanıma gəlib: «Ey Allahın qulu! Mənim haqqımı ver!» dedi. Mən də: «Burada gördüklərin dəvələr, inəklər, qoyun və qullar sənin pulunun dövriyyəsindən artıb çoxalmışdır!» dedim. O: «Ey Allahın qulu! Məni ələ salma!» deyə cavab verdi. Mən də: «Mən səni ələ salmıram!» dedim. O, da heç bir şey mənə saxlamayıb (hər şeyi) götürüb getdi. «Allahım! Əgər mən bunu sənin rizanı (rəhmini, mərhəmətini) qazanmaq üçün etmişəmsə onda bizi bu bəladan (vəziyyətdən) qurtar!» deyə dua etdi. Bundan sonra qaya parçası onlar çıxa biləcək qədər aralandı və onlar çıxıb yollarına davam etdilər»[76].

## ON ALTINCI HƏDİS
### (ŞÜKR ETMƏYİN FƏZİLƏTİ)

***«Allah sizi analarınızın bətnlərindən heç bir şey bilmədiyiniz*** *(dərk etmədiyiniz)* ***halda çıxartdı. Sonra sizə qulaq, göz və qəlb verdi ki, bəlkə şükr edəsiniz!»*** *(ən-Nəhl 78).* ***«****(Ya Peyğəmbər!)* ***De ki: «Sizi yoxdan yaradan, sizə qulaq, göz və qəlb verən Odur.*** *(Allahın nemətlərinə)* ***nə az şükr edirsiniz!»*** *(əl-Mulk 23).*

Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah – *subhənəhu və təalə* – İsrail oğullarından cüzəm xəstəliyinə tutulanı, keçəli və koru imtahan etmək üçün yanlarına bir mələk göndərir. Mələk cüzəm xəstəliyinə tutulanınn yanına gələrək: «Ən çox nəyi arzu edirsən?» deyə soruşur. Cüzəm: «Gözəl rəng, gözəl dəri və insanları məndən iyrəndirərək uzaqlaşdıran bu xəstəliyin getməsini arzu edirəm!» dedi. Mələk cüzəmin vücuduna əl sürtdü. Dərhal ondan bu xəstəlik getdi və ona gözəl rənglə, gözəl dəri verildi. Mələk: «Ən çox sevdiyin mal hansıdır?» dedi. Cüzəm: «Dəvə və ya inək!» deyə cavab verdi. Ona on aylıq bir dəvə verildi. Mələk: «Allah bunu sənin üçün bərəkətli etsin!» deyə dua etdi. Sonra mələk keçəlin yanına gələrək: «Ən çox nəyi arzu edirsən?» deyə soruşur. Keçəl: «Gözəl saç və insanları diksinərərək məndən uzaqlaşdıran bu keçəlliyin getməsini arzu edirəm!» deyə cavab verdi. Mələk onun da vücuduna əl sürtdü. Dərhal keçəllik ondan gedərək yerinə gözəl saç verildi. Mələk: «Ən çox sevdiyin mal hansıdır?» dedi. Keçəl: «İnək!» deyə cavab verdi. Ona da balalı bir inək verildi. Mələk: «Allah bunu sənin üçün bərəkətli etsin!» deyə dua etdi. Sonra mələk korun yanına gələrək: «Sən ən çox nəyi arzulayırsan?» deyə soruşur. Kor: «Allahdan gözlərimi geri qaytarmasını və insanları görməyimi arzu edirəm!» deyə cavab verdi. Mələk ona da əl sürtdü və Allah ona görmə qabiliyyətini verdi. Mələk: «Ən çox sevdiyin mal hansıdır?» dedi. Kor: «Qoyun!» deyə cavab verdi. Ona da balalı qoyun verildi.

Bir müddətdən sonra dəvə və mal-qara sahiblərinin heyvanları bala verdilər. Qoyun sahibinin də qoyunu quzuladı. O, qədər ki, dəvə sahiblərinin bir vadi dəvəsi, mal-qara sahibinin bir vadi mal-qarası, qoyun sahibinin də bir vadi dolusu qoyunları oldu.

Günlərin birində mələk bu üç kimsə ilə görüşmək üçün ilk görüşdüyü surətdə cüzəmin yanına gəldi və ona: «Mən kasıb birisiyəm. Səfər zamanı bütün azuqəmdən məhrum olmuşam. Bu günki gündə Allahdan, sonra da səndən başqa müraciət edəcəyim yer yoxdur. Sənə gözəl rəng, gözəl dəri və gözəl mal verən Allah xatirinə səndən bu səfərimi bitirib (yurduma) çatmaq üçün dəvə istəyirəm. Cüzəm: «Borcum çoxdur və (sənə verəcəyim malım da yoxdur)» dedi. Mələk: «Mən səni tanıyıram. Sən insanların iyrənərək çəkindiyi və Allahın var-dövlət verdiyi kasıb deyilsən?» dedi. Cüzəm: «Xeyr, mənə bu mal-qara ata babamdan mülk qalıb!» deyə cavab verdi. Mələk: «Əgər sən yalan deyirsənsə qoy Allah səni əvvəlki vəziyyətinə qaytarsın!» dedi. Sonra mələk keçəlin yanına gəldiyi ilk görkəmdə gələrək ona da cüzəmə dediyi sözlərin eynisini dedi. Keçəl də cüzəmin verdiyi cavabın eynisini vedi. Mələk ona da bəd dua edərək: «Qoy Allah səni də əvvəlki vəziyyətinə qaytarsın?» dedi. Mələk bundan əvvəlki surətdə gəldiyi kimi korun da yanına gələrək ona da: «Mən kasıb birisiyəm. Səfər zamanı bütün azuqəmdən məhrum olmuşam. Bu günki gündə Allahdan, sonra

[76] Buxari 3465, Müslim 2743.

səndən başqa müraciət edəcəyim yer yoxdur. Sənə gözünü qaytaran Allah and verirəm səndən bu səfərimi bitirib (yurduma) çatmaq üçün qoyun istəyirəm». Kor: «İstədiyin qədər götür və istədiyin qədər də saxla. Həqiqətən mən kor bir kimsə idim. Allah mənə gözlərimin nurunu verdi. Vallahi bu gün Allah üçün alacağın (götürəcəyin) heç bir şeydə sənə əngəl olmayacağam və götürdüklərini geri qaytarılmasını da istəmirəm!» deyə cavab verdi. Mələk: «Malını saxla özünə. Allah sizləri imtahan etdi və səndən də razı qaldı. O, iki yoldaşına isə qəzəb etdi» deyə cavab verdi[77].

## ON YEDDİNCİ HƏDİS

### (ALLAH – *subhənəhu və təalə* - nin BƏZİ QULLARINA VERMİŞ OLDUĞU KƏRAMƏT)

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Beşikdə ikən yalnız üç uşaq danışmışdır. Bunlardan biri Məryəm oğlu İsa – *əleyhissəlam* –, (ikincisi isə İsrail oğulları zamanı yaşayan) Cureyc adında bir nəfərin sahibi danışmışdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Cureyc abid (çox ibadət edən) bir kimsə idi. Özünə ibadətgah düzəldib orada da qalardı. Bir gün namazda ikən anası gəlib: «Ya Cureyc!» deyə səslədi. Cureyc: «(Öz-özündə) Ya Rəbbim! Anam yoxsa namazım! (yəni anama cavab verim, yoxsa namazıma davam edim) deyə düşündü və namazını seçərək davam etdi. Anası da cavab almadığı üçün dönüb getdi. Səhər anası yenə də gəldi. Cureyc yenə də namaz üstə idi. Anası: «Ya Cureyc!» deyə səslədi. Cureyc: «Ya Rəbbim! Anam, yoxsa namazım!» deyə düşündü və yenə də namazını seçərək davam etdi. Anası yenə də cavab almadığı üçün dönüb getdi. Səhəri Cureyc namaz qılarkən anası yenə də gəldi və: «Ya Cureyc!» deyə səslədi. Cureyc: «Ya Rəbbim! Anam yoxsa namazım!» deyə düşündü və yenə də namazına üstünlük verərək davam etməyə başladı. Beləcə üç dəfə çağırdığı halda cavab almayan ana: «Ya Rəbbim! Bu oğlumu fahişə qadınların üzünə baxmadıqca Sən onu öldürmə (onun canını alma)!» deyə bəd dua etdi.

İsrail oğulları bir-birlərinə Cureyc və onun israrlı ibadətini zikr edərək danışırdılar. Bu vaxt onlardan gözəlliyi dillərdə dastan olan fahişə bir qadın vardı ki, o qadın İsrail topluluğuna: «Əgər istəsəniz mən o, abid Cureyci sizin üçün yolundan çıxardaram!» dedi. O, qadın Cureycin yanına gələrək özünü ona təklif etdi. Lakin Cureyc heç ona tərəf dönüb baxmadı. O, azğın qadın Cureycin ibadətgahında qalan çobanın yanına gedib özünü ona təslim etdi. Çoban da onunla cima (yaxınlıq) etdi. Qadın bu cimadan (yaxınlıqdan) hamilə qalıb bir oğlan uşağı doğdu. (Aləmə car çəkərək): «Bu oğlan uşağı Cureycdəndir!» dedi. Camaat da Cureycin ibadətgahına gəlib onu aşağı endirdilər. Evini (ibadətgahını) dağıdıb, özünü də döyməyə başladılar. Cureyc onlara: «Sizə nə olub?» deyə soruşdu. Onlar: «Sən bu fahişə qadınla cima (yaxınlıq) etdin və o, da səndən bir uşaq doğdu!» dedilər. Cureyc: «Uşaq haradadır?» deyə soruşdu. Onlar uşağı gətirdilər. Cureyc: «Məni buraxın namaz qılım!» dedi. Namazını qılıb uşağın yanına yaxınlaşdı. Uşağın qarnına toxunaraq: «Ey uşaq sənin atan kimdir?» deyə soruşdu. Uşaq: «Mənim atam filan çobandır!» dedi. Bu qəribə halı görən camaat Cureycin üzərinə yürüyərək onu öpməyə və əlləri ilə ona toxunmağa başladılar. Camaat: «Biz sənin ibadətgahını qızıldan düzəldəcəyik!» dedilər. Cureyc: «Xeyr! Siz onu əvvəlki vəziyyətinə qaytarın!» dedi. Onlar da onun dediyi kimi etdilər.

Başqa rəvayətdə - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əgər anası onun əleyhinə fitnəyə (zinaya) düşməsini dua etmiş olsaydı Cureyc şübhəsiz ki, bu fitnəyə düşərdi». Başqa rəvayətdə - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlardan heç bir kimsə beşikdə ikən danışmamışdır. Yalnız Məryəm oğlu İsa – *əleyhissəlam* – ilə, Cureycin sahibi danışmışdır. (Səhabələrdən biri): «Ya Rəsulallah! Cureycin sahibi kimdir?» deyə soruşdu. Peyğəmbər: «Cureyc ibadətgahda ibadət edən bir kimsə idi. İbadətgahın yanında bir çoban da qalırdı. Bu çobanın yanına (İsrail oğullarından) olan fahişə bir qadın daima gəlib gedərdi. Bir gün namazda ikən anası gəlib: «Ya Cureyc!» deyə səslədi. Cureyc: «(Öz-özündə) Ya Rəbbim! Anam yoxsa namazım! (yəni anama cavab verim yoxsa namazıma davam edim) deyə düşündü və namazını səçərək davam etdi. Anası da cavab almadığı üçün dönüb getdi. Səhər anası yenə də gəldi. Cureyc yenə də namaz qılan halda idi. Anası: «Ya Cureyc!» deyə səslədi. Cureyc: «Ya Rəbbim! Anam yoxsa namazım!» deyə düşündü və yenə də namazını seçərək davam etdi. Anası yenə də cavab almadığı üçün dönüb getdi. Səhəri Cureyc namaz qılarkən anası yenə də gəldi və: «Ya Cureyc!» deyə səslədi. Cureyc: «Ya Rəbbim! Anam yoxsa namazım!» deyə düşündü və yenə də namazına üstünlük verərək davam etməyə başladı. Beləcə üç dəfə çağırdığı halda cavab almayan ana: «Ya Rəbbim! Bu oğlumu fahişə qadınların üzünə baxmadıqca Sən onu öldürmə (onun canını alma)!» deyə bəd dua etdi.

Bir müddətdən sonra (çobanın yanına gəlib-gedən) o, qadın hamilə qalıb bir uşaq doğdu. O, qadın doğduğu uşaqla birlikdə məmləkətin hökmdarının yanına gətirildi. Hökmdar: «Bu uşaq kimdəndir?» deyə soruşdu. Qadın: «Cureycdən!» dedi. Hökmdar yenə: «İbadətgahın sahibindənmi?» deyə soruşdu. Qadın: «Bəli!» dedi. Hökmdar: «İbadət-gahı dağıdın, onu (Cureycin) özünü isə bura gətirin!» deyə əmr verdi. Baltalarla ibadətgahı vurub dağıtdılar. Cureycin qollarını bağlayıb (hökmdarın) yanına gətirdilər. Fahişələrin yanına çıxarıldıqda Cureyc gülümsədi. Onlar da insanlar içərisindən Cureycə baxırdılar. Hökmdar: «Bu

[77] Buxari 3464, Müslim 2964.

qadın nə iddia edir?» dedi. Cureyc: «Nə iddia edir?» deyincə hökmdar: «İddia edir ki, bu uşaq səndəndir!». Cureyc qadına: «Sən bu cür iddia edirsən?» dedi. Qadın da: «Bəli!» deyə cavab verdi. Cureyc: «Uşaq haradadır?» deyə soruşdu. «O, qadının qucağındadır!» dedilər. Cureyc uşağa tərəf dönüb: «Sənin atan kimdir?» dedi. Uşaq: «Filan çobandır!» deyə cavab verdi. (Bu halı görən) Hökmdar: «Sənin ibadətgahını qızıldan düzəldəkmi?» dedi. Cureyc: «Xeyr!» deyə cavab verdi. Hökmdar yenə də: «Sənin ibadətgahını gümüşdən düzəldəkmi?» dedi. Cureyc: «Xeyr!» deyə cavab verdi. Hökmdar: «Yaxşı onda nə edək?» deyincə Cureyc: «Onu əvvəlki vəziyyətinə qaytarın!» dedi. Hökmdar: «Sən mənim yanıma gələndə niyə gülümsədin?» deyə soruşdu. Cureyc: «Xatırladığım bir işə gülümsədim, anamın bəd duası qəbul olundu!» dedi. Sonra başına gələn hadısəni onlara xatırlatdı.

(Beşikdə danışan üçüncü uşağa) gəldikdə isə: «Anasından süd əmməkdə olan bir anda onların yanından yaraşıqlı bir atın üzərində gözəl görkəmə malik olan bir süvari keçdi. Uşağın anası süvarini görcək: «Ya Rəbbim! Oğlumu bunun kimi heybətli et!» deyə dua etdi. Bu an uşaq dərhal anasının döşünü buraxıb o, süvariyə tərəf dönüb baxaraq: «Ya Rəbbim! Məni onun kimi etmə!» deyə dua etdi. Sonra yenə də anasının döşünə tərəf dönərək əmməyə başladı. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizə bu hədisi danışarkən şəhadət barmağını ağzına qoyub onu əmməyə başlayaraq uşağın əmməsini bizə təmsil edərək göstərməsi hələ də gözümün qarşısındadır.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – sözünə davam edərək: «Bir müddətdən sonra o, əmzikli qadının yanından, yanlarında (həbs edilmiş) cariyə olan bir qrup camaat keçirdi. Onlar cariyəyə: «Sən zina etdin! Sən oğurluq etdin!» deyir və onu döyürdülər. Cariyə isə: «***HASBİYƏLLAHU VƏ NİMƏL VƏKİL*** – Allah mənə yetər O, nə gözəl vəkildir!» deyərək gedirdi. Uşağın anası bu mənzərəni gördükdə: «Ya Rəbbim! Mənim oğlumu bu cariyə kimi etmə!» deyə dua etdi. Uşaq yenə də əmməyi buraxaraq cariyəyə tərəf baxaraq: «Ya Rəbbim! Məni onun kimi et!» deyə dua etdi. Bundan sonra ana ilə oğul bir-birləri ilə danışmağa başladılar. Ana: «Gözəl görkəmli bir süvari keçdikdə mən: «Ya Rəbbim! Oğlumu bunun kimi heybətli et!» deyə dua etdim. Sən isə: «Ya Rəbbim! Məni onun kimi etmə!» deyə dua etdin. Sonra yanımızdan: «Sən zina etdin! Sən oğurluq etdin!» deyə üstünə qışqıraraq (təhqir edilən) bir cariyə keçdi. Mən: «Ya Rəbbim! Mənim oğlumu bu cariyə kimi etmə!» deyə dua etdim. Sən isə: «Ya Rəbbim! Məni onun kimi et!» deyə dua etdin. (Bunun hikməti nədir?) Uşaq: «O, gördüyün süvari çox zalım və təkəbbürlü bir kimsə idi. Buna görə də mən: «Ya Rəbbim! Məni onun kimi etmə!» deyə dua etdim. O, ki, qaldı: «Sən zina etdin! Sən oğurluq etdin!» dedikləri cariyəyə: «O, nə zina etmişdi, nə də oğurluq. Buna görə də mən: «Ya Rəbbim! Məni onun kimi et!» deyə dua etdim[78].

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İsrail oğullarından bir kimsə digər birindən (dostundan) min dinar həcimində borc pul istəyir. Pulu verən şəxs: «Şahidini gətir!» deyir. Borc istəyən şəxs: ***«Şahid olaraq Allah kifayət edər!».*** *(ən-Nisa 79)* deyə cavab verdi. Pulu verən şəxs: «Onda zamin gətir!» dedi. Borc istəyən şəxs: «Zamin olaraq da Allah kifayət edər!» deyə cavab verir. Pulu verən şəxs: «Sən həqiqətən doğru söylədin və vədələşmə (razılıq) ilə ona (müəyyən olunmuş bir müddətə) qədər min dinar borc pul verir». Pulu alan şəxs dərhal dəniz səfərinə çıxır. Lazımı işlərini gördükdən sonra (borcu ödəmək üçün müəyyən olunmuş vaxt gəlib çatdıqda) geri qayıtmaqdan ötrü gəmi axtarmağa başlyır. Lakin qayıtmaq üçün gəmi tapa bilmədikdə bir odun parçasını tapıb içini ovur. İçinə min dinar borc götürdüyü pulu və bir də o, kimsəyə yazdığı məktubu (kağız parçasını) qoyur. Ovulmuş yerin ağzını yaxşıca bağladıq-dan sonra (odun parçasını) dəniz kənarına gətirərək: «Allahummə! Sən bilirsən ki, mən filan kimsədən min dinar borc pul istədim. O, da məndən bir şahid istədi. Mən: ***«Şahid olaraq Allah kifayət edər!».*** *(ən-Nisa 79)* deyə cavab verdim. O, da sənin şahidliyinə razı oldu. Sonra məndən bir zamin istədi. Mən də: «Zamin olaraq da Allah kifayət edər!» deyə cavab verdim. O, yenə də sənin zaminliyinə razı oldu və (min dinar borc pulu mənə verdi). (Müəyyən olunmuş vaxtda) O, borcu geri qaytarmaq üçün gəmi tapmağa çalışdım. Lakin tapmaq iqtidarına nail olmadım. Artıq mən bu min dinar borcu Sənin qorumağına əmanət edirəm!» deyə dua edərək o, odun parçasını dənizə buraxır. (Müəyyən olunmuş vaxt) gəlib çatdıqda pulu verən kimsə dəniz sahilinə çıxaraq: «Bəlkə bir gəmi malımı gətirmiş ola!» deyə gözləməyə başlayır. (Lakin vaxt keçir, gəmi isə gəlib çıxmaq bilmirdi). (Evə qayıtmaq istədikdə) Gözü sahildə olan bir odun parçasına sataşır. Ailəsi odun kimi (yandırmaq üçün) istifadə etsin deyə götürüb evinə gətirir. Evə gəldikdə odun parçasını parçalayaraq iki hissəyə bölür. İçindən (borc) pullar və bir də (filankəsdən-filankəsə) imzalanmış bir məktub çıxır.

(Bir müddətdən sonra) Borclu olan kimsə borc verən kimsənin yanına min dinar pul ilə gəlib: «Allaha and olsun ki, (müəyyən olunmuş vaxtda) borcu sənə gətirmək üçün gəmi axtardım. Lakin o, an bir gəmi də olsun belə tapa bilmədim» dedi və borcunu ona verir. Borc verən kimsə: «Sən mənə bir şey göndərdinmi?» deyə soruşur. Borclu: «Mən sənə dedim axı (müəyyən olunmuş vaxtda) borcu ödəmək üçün sənin yanına gəlmək istədim. Lakin bir gəmi də belə tapa bilmədim» dedi. Borc verən kimsə: «Şübhəsiz ki, Allah sənin odun

[78] Buxari 3436, Müslim 2550.

içində göndərmiş olduğun borcunu sənin adına ödəmişdir. Təkrar vermək üçün gətirdiyin bu min dinarı isə geri götür!» dedi[79].

## ON SƏKKİZİNCİ HƏDİS
### (YƏUMUL-FƏSL – AYIRD ETMƏ GÜNÜ)

***«O, gün üzlər Rəbbinin gül camalına baxıb sevinəcəkdir».*** *(əl-Qiyamə 22-23).*

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – in zamanında bir qurup insanlar: «Ya Rəsulallah! Qiyamət günü Rəbbimizi görəcəyikmi?» deyə soruşdular. (Peyğəmbər): «Bədirlənmiş ayı yanında bulud olmayan açıq havada görməkdə şübhə edirsinizmi?». Onlar: «Xeyr, Ya Rəsulallah!» dedilər. (Peyğəmbər): «Yanında bulud olmayan açıq havada günəşi görməkdə şübhə edirsinizmi?». Onlar: «Xeyr, Ya Rəsulallah!» dedilər. (Peyğəmbər): «Sizlər onu (Allahı) beləcə görəcəksiniz?» deyə buyurdu.

Qiyamət günü insanlar bir yerə toplanacaqlar. Allah: «(Dünyada ikən) Kim nəyə ibadət edirdisə onun ardınca düşsün!» deyə buyurur. Onlardan kimiləri günəşin, kimiləri ayın, kimiləri də tağutların[80] ardınca düşürlər. Bu ümmət isə münafiqləri də içində olduqları halda (yerlərində) durub qalırlar. Allah – *subhənəhu və təalə* – onların yanlarına (tanıdıqlarından başqa bir surətdə) yaxınlaşıb: «Mən sizin Rəbbinizəm!» deyə buyurur. Onlar da: «Rəbbimiz gələnə qədər bizim yerimiz buradır. Buradan heç bir yana tərpənməyəcəyik. Rəbbimiz gəldikdə isə biz onu tanıyacağıq (sən bizim Rəbbimiz deyilsən)» deyirlər. Bundan sonra Allah – *subhənəhu və təalə* – (ikinci dəfə) onların yanına gəlir və: «Mən sizin Rəbbinizəm!» deyə buyurur. Onlar da: «Bəli, sən bizim Rəbbimizsən!» deyirlər. Sonra Allah – *subhənəhu və təalə* – onları çağırır və Cəhənnəm üzərindən Sırat – körpüsü qurulur. Ümmətimlə bərabər körpünün üstündən keçən Peyğəmbərlərin ilki mən olacağam. O, gün Peyğəmbər-lərdən başqa heç bir kimsə danışmaz. Peyğəmbərlərin danışması isə: «Allahım salamat et! Allahım salamat et! (qoru)» deyə olacaqdır. Cəhənnəmdə qırmaqlar vardır. Eyni ilə Sadan[81] tikanları kimidir. (Peyğəmbər): «Sadan tikanlarını gördünüzmü?» deyə buyurdu. (Səhabələr): «Bəli» deyə cavab verdilər. (Peyğəmbər): «Həqiqətən o, qırmaqlar Sadan tikanları kimidir. Ancaq o, qırmaqların böyüklüyünü Allahdan başqa heç kəs bilməz. Bu qırmaqlar insanları (pis) əməllərindən aslı olaraq tutub yaxalayacaqlar. Kimiləri öz (pis) əməllərinə görə məhv olacaq, kimilərindən də bir parça qopardılacaqdır. Sonunda isə onlar qurtulacaqlar. Bundan sonra Allah – *subhənəhu və təalə* – rəhmətindən olaraq, qulları arasında Cəhənnəm əhlindən dilədiklərini Cəhənnəmdən çıxartmağı əmr edərək mələklərə: «Lə İləhə İlləllah» – deyənlərdən, Allahın mərhəmət buyurduğu kimsələrdən, Allaha bir şeyi şərik (ortaq) qoşmamış olanları Cəhənnəmdən çıxarsınlar!» deyə əmr edir. Mələklər: «Onları Cəhənnəmdə səcdə yerlərindən tanıyırlar. Atəş Adəm oğullarının səcdə yeri müstəsna, hər bir yerini yeyir. Allah səcdə yerinə toxunmağı atəşə haram etmişdir!». Onlar atəşdən yanmış, qap-qara halda çıxardılarlar. Onların üzərlərinə Həyat Suyu adlanan sudan tökərlər. Onlar selin gətirdiyi toxumlar kimi cücərməyə başlayarlar. Allah – *subhənəhu və təalə* – öz qulları üzərində haqq-hesabı çəkib bitirdikdən sonraCənnət ilə Cəhənnəm arasında bir nəfər qalır. Bu kimsə Cənnətə girən ən son Cəhənnəmlik olacaqdır. (Başqa rəvayətdə: «Bu kimsə Cənnət əhlinin Cənnətə ən son girəni olacaqdır»). Onun üzü Cəhənnəmə tərəf yönəlmiş olacaqdır. O, kimsə: «Ya Rəbbim! Üzümü Cəhənnəmdən çevir onun isti küləyi (qoxusu) məni zəhərləyib öldürür, atəşi isə məni yandırır». Allah: «Əgər sənin istədiyin yerinə yetsə bundan sonra məndən başqa bir şey istəyəcəksənmi?» deyə buyurur. O, kimsə: «İzzətinə and olsun ki, xeyr!» deyərək Allaha (bu işdə) and və söz verir. Allah onun üzünü Cəhənnəm atəşindən çevirir. O, kimsə üzünü Cənnətə tərəf çevirdikdə oranın gözəlliyini görüb Allahın dilədiyi müddət qədər susduqdan sonra: «Ey Rəbbim! Məni Cənnətin qapısına yaxınlaşdır» deyir. Allah: «Məgər sən and içməmişdin ki, Məndən bu istədiyindən başqa bir şey istəməyəcəksən?». O, kimsə: «Ey Rəbbim! Yaratdıqlarının ən bədbəxti olmamaqdan ötrü!» deyir. Allah: «Əgər sənin bu istədiyin də yerinə yetsə bundan sonra məndən başqa bir şey istəyəcəksənmi?» deyə buyurur. O, kimsə: «İzzətinə and olsun ki, xeyr!» deyərək Allaha (bu işdə) and və söz verir. Allah onu Cənnətin qapısına yaxınlaşdırır. O, kimsə Cənnətin qapısına yaxınlaşdıqda orada olan gözəlliyi, içindəki sevinci və rəngarəngliyi gördükdə Allahın dilədiyi müddət qədər susduqdan sonra: «Ey Rəbbim! Məni Cənnətə sal!» deyir. Allah: «Vay sənə ey Adəm oğlu! Nə qədər sən öz sözündən dönürsən! Məgər sən and içməmişdin ki, Məndən bu istədiyindən başqa bir şey istəməyəcəksən?». O, kimsə: «Ey Rəbbim! Məni yaratdıqlarının ən bədbəxti etmə!» deyəcəkdir. Allah – *subhənəhu və təalə* – gülər və ona Cənnətə girməyə izn verər və ona: «Dilədiyini istə!» buyurar. O, da arzuladığı şeyləri tükənənə qədər istəyəcəkdir. Arzuladığı şeylər tükəndikdən sonra Allah: «Bunu da, bunu da (əlavə et) buyuraraq ona istədiklərini xatırladacaqdır. Sonda bütün istədikləri bitdikdən sonra Allah: «Bunların hamısı və bir o, qədər də sənindir!» deyə buyurur.

---

[79] Buxari 1498,2991.

[80] ***TAĞUT*** – tüğyan sözündəndir. Həddi aşmaq deməkdir. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir: «Tağut bəndənin ibadətdə, itaətdə və tabeçilikdə ifrata varması, həddi aşmasıdır. Allah və Rəsulunu buraxıb onların əvəzində ibadət etdiyi, itaət etdiyi və ardınca getdiyi kimsə deməkdir.

[81] Tikanlı bitki növüdür.

Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – Əbu Hureyrə - *radıyallahu anhu* – ya həqiqətən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah, bunlar hamısı və daha on misli qədər də sənindir». Buna Əbu Hureyrə - *radıyallahu anhu* – cavab verərək dedi: «Mən onu yadda saxladım ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sənə bu istəklərinin yanında bir o, qədər də verilmişdir». Əbu Səid - *radıyallahu anhu* – deyir: «Mən eşitdim ki, O, deyir: «Sənə bu istəklərinin yanında on misli daha vardır»[82]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in zamanında bir qurup insanlar: «Ya Rəsulallah! Qiyamət günü Rəbbimizi görəcəyikmi?» Peyğəmbər: «Bəli, görəcəksiniz!» dedi və sözünə davam edərək: «Yanında bulud olmayan açıq bir havada günəşi görməyə çətinlik çəkirsinizmi? Bədirlənmiş ayı 14-cü gündə yanında bulud olmayan açıq havada görməyə çətinlik çəkirsinizmi?». Onlar: «Xeyr, Ya Rəsulallah». O: «Günəşi və ayı görməkdə əziyyət çəkmədiyiniz kimi Allahı da görməkdə heç bir əziyyət çəkməyəcəksiniz» deyə buyurdu.

Qiyamət günü olduqda bir carçı qışqıraraq: «Hər ümmət (dünyada ikən) kimə ibadət edirdisə qoy onun ardınca düşsün». Bundan sonra Allahdan başqa bütlərə, tağutlara və s. ibadət edənlərin hamısı heç bir kimsə qalmadan Cəhənnəmə sürüklənirlər. Sonda yalnız əməlisaleh kimsələr, (Allaha ibadət edən) günahkarlar, həmçinin də Kitab Əhlindən bir qurup kimsələr qalır. İlk öncə Yəhudilər çağrılırlar və onlardan: «(Dünyada ikən) Nəyə ibadət edirdiniz?» deyə soruşulur. Onlar: «Biz Allahın oğlu Üzeyr – *əleyhissəlam* – a ibadət edirdik!» deyərlər. Onlara: «Yalan deyirsiniz! Allah özünə nə bir zövcə (yoldaş), nə də bir övlad götürmüşdür! (İndi) Nə istəyirsiniz?». Onlar: «Ey Rəbbimiz! Biz çox susadıq, bizə su ehsan et!» deyərlər. Onda onlara: «Ora su içməyə gedərsinizmi?» deyə işarə edilərək Cəhənnəmə sürüklənirlər. Cəhənnəm onlara şərab (ilğım) kimi görsənir. Onlar da onu (su zənn) edib Cəhənnəmə tökülürlər. Sonra Xristianlar çağrılaraq onlara da: «(Dünyada ikən) Nəyə ibadət edirdiniz?» deyə soruşulur. Onlar: «Biz Allahın oğlu İsa – *əleyhissəlam* – a ibadət edirdik!» deyərlər. Onlara: «Yalan deyirsiniz! Allah özünə nə bir zövcə (yoldaş), nə də bir övlad götürmüşdür! (İndi) Nə istəyirsiniz?». Onlar: «Ey Rəbbimiz! Biz çox susadıq, bizə su ehsan et!» deyərlər. Onda onlara: «Ora su içməyə gedərsinizmi?» deyə işarə edilərək Cəhənnəmə sürüklənirlər. Cəhənnəm onlara şərab (ilğım) kimi görsənir. Onlar da onu (su zənn) edib Cəhənnəmə tökülürlər.

Sonda Allaha ibadət edən əməlisaleh və günahkar kimsələrdən başqası qalmaz. Aləmlərin Rəbbi olan Allah – *subhənəhu və təalə* – onların yanlarına (onların) tanımaqlarına yaxın bir surətdə gəlir və onlara: «Hər ümmət ibadət etdiyi şeyin ardınca düşmüşdür. Bəs siz nəyi gözləyirsiniz?» deyə buyurar. Onlar: «Biz dünyada ikən onlara möhtac olmağımıza baxmayaraq bu insanlardan ayrı olduq və onlarla dostluq etmədik. Biz ibadət etdiyimiz Rəbbimizi gözləyirik!» deyərlər. Allah: «Mən sizin Rəbbinizəm!» deyə buyurar. (Başqa rəvayətdə: «Onlar bir və ya iki dəfə: «Biz Allahla yanaşı başqa birisinə ibadət etmirik!» deyərlər. Hətta bir qismi (imtahanın şiddətindən doğru olandan) dönməyə yaxınlaşır. Sizinlə onun arasında bir əlamət varmı ki, bunun sayəsində siz onu tanıya biləsiniz. Onlar: «Bəli!» deyirlər. Bundan sonra Rəbbimiz (Qiyamət günü) ayağını ortaya çıxarır (göstərir) və bütün mömin kişi və qadınlar onun qarşısında səcdəyə qapanırlar. (Yalnız) dünyada ikən göstəriş və riyakarlıqla səcdə edənlər qalırlar. (Onlardan hər biri) səcdə etməyə çalışarlar. Lakin onların onurğa sümükləri tək bir sümük halına düşər (əyilməz) və (onlar səcdə edə bilməzlər)». Sonra başlarını (səcdədən) qaldırırlar. İlk dəfə görmüş olduqları surət dəyişmiş olaraq: «Mən sizin Rəbbinizəm!» deyə buyurar. Onlar da: «Bizim Rəbbimiz Sənsən!» deyərlər[83].

## ON DOQQUZUNCU HƏDİS
### (ONLARIN HƏYATI BİR İBRƏTDİR)

***«Biz Peyğəmbərlər göndərdik. Onların bəzisinin əhvalatını bundan əvvəl sənə danışdıq, bəzisinin əhvalatını isə söyləmədik!».*** *(ən-Nisa 164).*

İbn Abbas - *radıyallahu anhu* – deyir ki, Ubey b. Kəb - *radıyallahu anhu* – bizə belə rəvayət etdi ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «(Bir gün) Musa – *əleyhissəlam* – İsrail oğullarına xütbə ilə müraciət etdikdən sonra onlar (İsrail oğulları): «İnsanların ən elmlisi (alimi) kimdir?» deyə soruşdular. Musa: «İnsanların ən elmlisi (alimi) mənəm?» deyə cavab verdi. Lakin bu xüsusda elmi: «Allah ən gözəl bilir!» deyərək Allaha həvalə etmədiyindən ötrü Allah onun bu sözlərinə etiraz bildirərək: «Həqiqətən iki dənizin qovuşduğu yerdə mənim qullarımdan biri vardır ki, o səndən də çox elmlidir!» deyə ona vəhy etdi. Musa: «Ya Rəbbim! Mən onunla necə görüşə bilərəm?» deyə soruşdu. Ona: «Zənbilin içinə bir balıq qoy və (səfərə çıx), harada balığı itirsən mənim qulum orada olacaq!» deyə buyrudu. Bundan sonra Musa, yanında gənc xidmətçisi olan Yuşa b. Nun ilə birlikdə səfərə çıxdılar. Balığı zənbilin içində (xidmətçisi) daşıyırdı.

Nəhayət (iki dənizin qovuşduğu yerdə) bir qayanın yanına çatdılar. (İstirahət üçün qayanın yanında) Musa və yanındakı gənc xidmətçisi yuxuya daldılar. Bu an (zənbildə gətirdikləri) balıq zənbildən sıçrayıb çıxaraq dənizdə bir yarğana tərəf üz tutdu. (Dəniz içində belə bir yarğanın (yolun) açılması) Musa və onun gənc xidmətçisini çox təcüblən-dirdi. (Oyandıqdan sonra) onlar yollarına davam edərək bütün gecəni yol getdilər.

[82] Buxari 806, Müslim 182.
[83] Buxari 4581, Müslim 183.

Səhər açıldıqda, Musa öz xidmətçisinə: «Nahar yeməyimizi gətir. Bu səfər bizi lap əldən salıbdır!» dedi. Halbuki Musa (görüş üçün) əmr olunduğu yeri keçmədikcə heç bir yorğunluq hiss etməmişdir. Xidmətçisi: «İş burasındadır ki, biz qayanın yanında olduğumuz vaxt mən balıq haqqında təmamilə unutmuşdum. Doğrusu onu xatırlamağı mənə şeytandan başqası unutdurmadı. Balıq (dirilib) əcaib bir şəkildə dənizə tərəf yollandı!» deyə cavab verdi. Musa: «Elə bizim axtardığımız da budur!» deyə cavab verdi. Onlar öz izlərinə (ləpirlərinin) izinə düşərək gəldikləri yoll geri qayıtdılar. Gənc xidmətçi balığın getdiyi yeri ona göstərdi. Musa: «Mənə vəsf olunan yer elə buradır deyərək ətrafında o, şəxsi axtarmağa başladı. Nəhayət qaynın yanına çatdıqda əbaya bürünərək arxası üstə yatmış vəziyyətdə birisini – Xıdırı[84] gördülər». Musa: «Əssələmu Aleykum!» deyə onu salamladı. Xıdır üzünün örtüyünü açaraq: «Və Aleykuməs Salam! Sənin ölkəndə belə bir salam haqqında haradan bilirlər?» deyə soruşdu. Musa: «Mən – Musayam!» deyə cavab verdi. Xıdır: «İsrail oğullarından olan Musasan?» deyə soruşdu. Musa: «Bəli!» deyə cavab verdi. Xıdır: «Sən Allahın sənə öyrətdiyi elə bir elm üzərindəsən ki, mən onu bilmirəm. Mən də Allahın mənə öyrətdiyi elə bir elm üzərindəyəm ki, sən onu bilmirsən!» dedi. Musa: «Öyrədildiyin doğru yolu göstərən elmdən mənə öyrətmək şərtilə sənə tabe olummu?» deyə soruşdu. Xıdır: «Doğrusu sən (məndən öyrənmək üçün) mənimlə bir yerdə əsla səbr edib dözə bilməzsən. Axı sən (batininə, mahiyyətinə bələd olmadığın) bilmədiyin bir şeyə necə səbr edib dözə bilərsən. (Yəni – sənin onlara səbrin çatmaz, çünki mən batini elmlə iş görürəm. Sənin bildiyin isə ancaq zahiri elmdir)» deyə cavab verdi. Musa: «İnşəallah! Mənim səbrli olduğumu görəcəksən və sənin heç bir əmrindən çıxmayacağam!» deyə cavab verdi. Xıdır: «Əgər mənə tabe olacaqsansa, səbəbini sənə izah etmədikcə məndən heç bir şey haqqında soruşma» deyə cavab verdi. Musa: «Bəli!» dedi. Xıdır ilə Musa – *əleyhimussəlam* – gəmiləri olmadığı üçün dənizin sahili ilə getməyə başladılar. (Bir müddətdən sonra) bir gəminin yanına çatdılar. Onları da gəmiyə götürmələri üçün (dənizçilərdən) xahiş etdilər. Gəmiçilər Xıdır - *əleyhissəlam* – ı tanıdıqları üçün onlardan heç bir gediş haqqı da tələb etmədilər. (Bir müddətdən sonra) bir sərçə uçub gələrək gəminin kənarına qondu və dənizdən bir, iki dimdik su götürdü. (Bunu görəcək) Xıdır: «Ya Musa! Sənin aldığın elm ilə, mənim aldığım elm Allahın elmindən bu sərçənin dənizdən əskiltdiyi qədər belə əskiltməz!» dedi. (Bir müddətdən sonra) Xıdır gəminin (taxtalarından) birinə əl atıb onu sökməyə başladı. Musa: «(Bu) insanlar bizi öz gəmilərinə heç bir gediş haqqı tələb etmədən götürdülər. Sən isə bilə-bilə onların gəmilərini deşdin ki, onları suya qərq edərək batırasan. Doğrusu olduqca məzəmmətə layiq bir iş gördün!» dedi. Xıdır: «Mən sənə demədimmi ki, sən mənimlə bir yerdə (görəcəyim işlərə) görə əsla səbr edib dözə bilməyəcəksən!» deyə cavab verdi. Musa: «Unutduğum bir şeydən ötrü məni danlama və məni öz işimdə (sənə tabe olmaqda) çətinliyə salma!» dedi. Beləliklə Musa – *əleyhissəlam* – (səfərin ilk başında) birinci dəfə unutqanlıq göstərdi. Gəmidən düşdükdən sonra onlar yollarına davam etməyə başladılar. (Bir müddətdən sonra) uşaqlarla oynayan bir oğlan uşağını gördülər. Xıdır – *əleyhissəlam* – dərhal (uşaqlarla oynayan) oğlan uşağının yanına yaxınlaşaraq əliylə onun başından tutub yerində qopardı!». Musa: «Heç bir günah iş tutmayan, buna görə də qisasa layiq olmayan pak, məsum bir cana qəsd etdin? Doğrusu olduqca məzəmmətə layiq bir iş gördün!» dedi. Xıdır: «Mən sənə demədimmi ki, sən mənimlə bir yerdə (görəcəyim işlərə) görə əsla səbr edib dözə bilməyəcəksən!» deyə cavab verdi. Musa: «Əgər bundan sonra səndən bir şey haqqında xəbər alsam, bir daha mənimlə yoldaşlıq etmə. (Hərəkətlərinə etiraz etdiyim, səni qınadığım üçün) sən artıq mənim tərəfimdən üzürlüsən (məni atıb getməyə haqqın vardır) deyə cavab verdi. Sonra yenə də yollarına düzəlib getdilər. Axırda bir məmləkətin əhalisinə yetişib, onlardan yeməyə bir şey istədilər. Məmləkətin əhalisi onları qonaq (müsafir) etməkdən çəkindilər. Onlar o, məmləkətdə yıxılmaq (uçulmaq) üzərə olan bir divar gördülər. (Xıdır) o, divarı əlilə düzəltdi. Musa: «Bunlar elə bir qövümdür ki, biz onların yanına gəldik, lakin onlar bizi qonaq (müsafir) etməkdən çəkindilər. İstəsəydin sözsüz ki, bu iş müqabilində onlardan (çörək pulu) alardın!» dedi. Xıdır: «Bu o, deməkdir ki, artıq biz səninlə ayrılmalıyıq. Zahiri gördüyün və dözə bilmədiyin şeylərin daxili mənasını (batinini, mahiyyətini) sənə xəbər verəcəyəm.

Belə ki, gəmiyə gəlincə o, dənizdə işləyən bir qurup yoxsula məxsusdur. Ona görə mən onu xarab etdim ki, bu adamların arxasında hər bir yaxşı gəmini zorla (ədalətsiz olaraq) ələ keçirən bir hökmdar vardır. Gəmini almaq üçün gələn hökmüdar onun deşik olduğunu gördüyü zaman onu zorla ələ keçirməkdən vaz keçdi. Sonra gəmi sahibləri o, gəmini taxta ilə düzəldib təmir etdilər. Oğlan uşağına gəldikdə isə onun ata-anası mömin kimsələr idi. (Mən onun daxilinə baxıb) gördüm ki, həddi-buluğa yetişdiyi zaman kafir olacaqdır. Böyüdükdə isə ata-anasını da öz arxasınca azğınlığa, küfrə sürükləyəcəkdir. İstədim ki, Rəbbi onun əvəzində onlara daha təmiz və ata-anasına qarşı daha mərhəmətli olan başqa bir övlad versin. Divara gəldikdə isə o, məmləkətdə yaşayan iki yetim oğlanındır. Altında onlara çatan bir xəzinə vardır. Onların atası əməlisaleh bir adam idi. Allah onların həddi-buluğa çatmalarını və Rəbblərindən bir mərhəmət olaraq öz xəzinələrini tapıb çıxarmalarını istədi. (Ya Musa!) Mən bunları öz-özümdən etmədim. (Yalnız Allahın əmrini yerinə yetirdim). Sənin səbr edib dözə bilmədiyin şeylərin daxili (batini) mənası budur!» dedi.

[84] ***XIDIR*** – yaşıl, yaşıllıq deməkdir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Xıdıra – Xıdır deyilməsinin səbəbi budur: «Xıdır otsuz quru bir yerə oturduğu zaman o, otsuz yer yaşıllıqa qərq olardı (bürünərdi)» Buxari 3402.

